II DƏRƏCƏLI MƏQTƏBLƏR
və ŞƏXSI TƏHSIL UÇUN
TƏDRIS və PEDAGOƵI
QITABLARЬ

PROFESSOR N. MILKOVIÇ

# Jerin hajat və tarixi



1929

Jazanь: Professor N. Milkoviç.
Çevirəni: Kambaj Əlijev.



# JERIN HƏJAT və TARIXI

Tərcəməsinin redaktory: [redacted]



AZƏRNƏŞR
BAQI-1929

AZƏRNƏƺR mətbəəsində basıldı.
Baqı, Balзoj Marskoj və Krasno-
Presnensqi quçələrin tinində. № 16/36.
Baз Mətbyat Mudirliqi 1532
Sifaris 284 Sajı 3000

# I. Jer tarixinin xatirələri.

## Ƣiriş.

Bir tarixçi, insan cəmijjətinin tarixini өjrənməqə başladıkda,
ər şejdən kabak onyn dikkətini cəlb edən epoxaja mənsyb xati-
ələri araşdırmaga çalışar: rəsmi vəsikələri, ryznamaları və mua-
irlərin məqtyblarını, hadisələri qөzləri ilə qөrmuşlərin xatıratı-
ı өjrənir. Jazılmış materjallardan ilavə, өjrənməqdə oldygy əsrin
addi xatirələri məsələn: tiqililərinin stili, kab kacaklarının, aba-
anlık və alətlərinin tipləri, sənajei-nəfisə əsərləri hakkında da
ə'lymat toplar. Əqər өjrənilməqdə olan epoxa çok kədim zama-
a mənsyb isə, onyn jazılı xatirələrinə deməq olar qi, bel bag-
mak olmaz. Çok kədimdən kalmış şejlərin hamısı umymijjətlə
sanlar fəalijjətinin ancak by maddi məhsyllarından ibarətdur. In-
anların өz alətlərini kajırdıkları materjala qөrə arxeologlar çok-
n bəşərijjətin kədim tarixini bir sıra ajrı-ajrı epoxalara bөlmuş-
r və onlara dəmir, bronz (tync) və daş devrləri adını vermiş-
rdur. Daş devrinin өzu də jenə ən kədim daş (paleolit) və ja
lə jonylmamış kaba daş alətlər və jeni daş (neolit), ja inqi ci-
lanmış (pərdaxlanmış) daş alətlər devrinə bөlunmuşdur.

Arxeoloƶi tədkikatın verə bildiqləri misallardan birini qөs-
rəq.

Miladdan bir neçə əsr kabak, Avropada ən mədəni millət jy-
nlar idi. Kədim Jynanıstan ja inqi Ellada, bizə zənqin mədənij-
xatirələri, qөzəl hejqəltəraşlık və me'marlık əsərləri, juqsəq
najei-nəfisə ədəbijjatı kojmyşdyr və jynanlardan sonra butun za-
an içərisində Avropa xalkları jynanların by jaradıcılıklarına
jran kalmışlardyr. Byndan başka jynanlıların da өz xalklarının
ak qeçmişləri hakkında nagılları və ən'ənələri vardı. Kabakca
nlar ancak xalk jaddaşında saklanılan dastanlardan ibarət idi;
qin sonralar by dastanlar toplanılmış, Iljada və Odissej adlı iqi
ema şəqlinə salınmışdyr. Byna qөrə də bynları şair Homerə
ad etmişlərdur. Iljadanın mevzyyny by qunqu Dardanel boga-
nın qiçiq Asja sahilində olan Troja (ja inqi Iliona) şəhərinin jy-
n ordysy tərəfindən on illiq muhasərəsi təşqil etmişdur. Iljada
an dəstələrinin hərb hajatı mənzərələrini, onların rəhbərlərinin
xsijjətlərini təsvir etmişdur.

Əlbəttə jynanlar Iljadada tə'rif olynan hadisələrin dogrylygy hakkьnda şubhə etməjirdilər. Bynyn dogry olmasьnda yzyn muddət Avropa alimləri də şubhələnməjirdilər. Homerin təsvir etdiqi epoxanь jynan tarixinin ən kədim devri sajьrdьlar. Ancak hər iqi poemanьn jaradьcьsь bircə Homerin şəxsijjəti oldygy hakkьnda şubhələnirdilər.

Məşhyr nems arxeology Şliman da Iljada və Odessejin tərəfdarlarьndan idi. Şliman cur'ətli bir fiqir mejdana atdь: Homerin tə'riflədiqi jerlərdə həfrijjat aparmalь və Iljada da tə'rif olynan hadisələrin dogrylygyny subyt etməlidur. 1871-ci ildə Şilman Dardanel bogazь kьraklarьna qetmiş və kədim tajfalarьn ehtimallarьna qerə kədim Trojanьn bylyndygy Hissarlьk təpəsində həfrijjata başlamьşdyr. Şliman byrada dogrydan da toprak katь altьnda bir şəhər xarabasьnь aşqar etmişdur; laqin by xaraba nisbətən daha sonraqь zaman, jynan-Roma epoxasьna, tarixdə təzə Ilion adь ilə məşhyr olan şəhərə ajid idi. Ancak by xaraba altьnda Şliman bir neçə kat daha kədim insan jyrtlarь mejdana çьkarmьşdyr. Hissarlьk təpəsinin belə əlverişli vəzijjəti insanlarь bir neçə əsr muddətində byrada ɵz tiqililərini tiqməqə və bir jyrdyn yçyklarь uzərində diqərini tiqməqə məcbyr etmişdur. Tiqililərin bə'ziləri şəhər tiplərinə, diqərləri isə qənt tiplərinə bənzəjirdi. Şliman by tiqili katlarьndan hansьnьn Homerin Trojasьna ajid oldygyny həll etməli idi. Iljadanьn verdiqi mə'lymata tamamən inanan Şliman jangьdan məhv olmyş şəhərin izini aktarmagь kət' etdi; çunqu rəvajətə qerə muhasərənin axьrьnda Troja jandьrьlmьşdyr. Şliman, mədənijjət bəkijjələri olan katlarь, ust katlarь biri-biri dalьndan qeturməqə başladь və by halda Hissarlьk təpəsində bir-birinin ustunə dəşənmiş tamam dokkyz kat mejdana çьkardь (*şəqil*-1). Nihajət aşagьdan iqinci katda oddan xarab olmyş binalarьn izini qerdu. O belə kət' etdi qi, by həmin aradьgь Trojadyr və həmin katda kalmьş insan mədənijjətinin kalьgьnь toplamaga və ɵjrənməqə başladь.




Şəqil-1. Hissarlьk təpəsinin qəsiqi. 2. „Şliman“ Trojasь. 3. „Homer“ Trojasь. 4. Təzə Iljon.

Laqin by katьn mədənijjəti çok qasьb çьkmьşdь. Hər bir şejdən əvvəl Şlimanьn kabagьna bir şəhər xarabasь dejil, ancak xьrda daşdan və qərpiçdən tiqilmiş və aralarь qillə hɵrulmuş daş divarlь balaca bir kala çьkmьşdь. Iljadada, dəmirdən danьşьldьgьna bakmajarak, byrada dəmir alət tapьlmamьşdyr: byradaqь alətlər bronzdan idi və hətta bronzdan da artьk balta, təbər, nizə və ok qibi alətlər, cilalanmьş daşdan idi. Qildən olan şejlər çok kaba və ibtidai tipdə idi. Həmçinin allahlarьn butləri də kaba idi. Byndan başka kьzьl bəzəqlərdən ibarət hɵrulmuş xəzinələr tapьlmьşdь; belə qɵrunur qi, by əsrdə altьn çok təq-təq tapьlan şej imiş. Daha dərin katlarda metal alətlər qet-qedə azalmьş və ancak daş alətlər tapьlmьşdyr.



Şliman Troja həfrijjatьndan sonra, o saat işini Avropa Jynanьstanьna, kədim Miqen şəhərinin bylyndygy jerə qeçurmuşdur; rəvajətə qerə by şəhərdə Iljada kahramanlarьndan Agamemnon padşahlьk etmişdur. Miqendəqi həfrijjat daha zənqin materjal vermişdur. Byrada kaja içərisində qulli mikdarda və çok zərif, kijmətdar şejlər ilə doly məkbərə tapьlmьşdyr: by şejləri ɵlulər ilə bir jerdə kojyrlarmьş; tapьlan alətlərin də bronzdan oldygy qɵrulmuşdur. Daha son zamanlara mənsyb olan başka məkbərələrdə dəmir də tapьlmьşdyr. Deməq, belə qɵrunur qi, toprak altь katlardan alimlərin karşьsьna həkiki Homer epoxasь çьkmьşdyr.

Ancak Şlimanьn birinci qəşfindən çok az sonra, bir tərəfdən Troja və Miqendəqi tapgьlar, diqər tərəfdən də Iljadanьn ɵzundə tə'rif olynan şejlərin arasьnda olan açьk bir yjgynsyzlyk arxeologlarьn dikkətini cəlb etdi. Zənqin Miqen mədənijjətinin qasьb „Şliman“ Trojasьnьn mədənijjətinə nisbətlə daha jakьn zamanlara ajid oldygyna şubhə jok idi. Şlimanьn işlərini davam etdirən Derpfeld Hissarlьga kajьtdь, və jenidən Şliman qɵturduqu ust katlarь tədkik edib o fiqrə qəldi qi, Miqen mədənijjəti ilə mutəcanis olan mədənijjət xatirələri, orada Şliman zənn etdiqindən dɵrt kat jykarьda imiş. Derpfeld aşagьdan e'tibarən altьncь katda Şlimanьn çok hərisanə bir syrətdə tapmak istədiqi həkiki Homer Trojasьnьn kalьklarьnь tapdь. Şliman isə vaktilə bynlara lazьmьnca fiqir verməjib byrakmьşdь. Diqər tərəfdən Miqen epoxasьnda jaşajan insanlarьn jaşajьşlarь, Homer kahramanlarьnьn jaşajьşьndan bir çok şejdə fərkli idi. Belə qi, Iljada kahramanlarь ɵlulərini jandьrьrdьlar; byrada isə ɵluləri kijmətli şejlərlə zənqin bəzəjərəq, daş məkbərələrdə basdьrьrdьlar və ɵlulərin başlarьna kьzьl maskalar qejdirirdilər. Poemalarьn təsvir etdiqi Homer jaşajьşь umymijjətlə Miqen epoxasьnьn jaşajьşьndan çok-çok sadə və qasьb idi.

XIX-əsrin axьrьnda Qrid adasьnda qeniş həfrijjat japьlmьşdyr. Byrada arxeologlar tarixi Knos şəhərinin jerində bɵjuq saraj xarabasь tapmьşlardyr; by saraj hakkьnda jynanlarьn ɵzlərinin nagьllarьnda xatirələr saklanьlmьşdyr. Byny „Labirint“ adlandьrmьşlar və bynyn tiqilməsini qirid padşahь Minosyn adьna jazmьşlardyr. Alimlər Knos katlarьnda qɵmulmuş mədənijjət kalьklarьnь

dikkətli tədkik edərəq ƣɵrdulər qi, byrada, bynlarьn karşьsьnda kədim mədənijjətin tarixi, Miqen və Trojadaqьndan daha muqəmməl syrətdə mejdana çьkьr; və byrada mədəni katlarьn ədədi daha çok, və Hissarlьkdaqьndan daha kalьn oldygyndan, ajdьndyr qi, mədənijjət Qiriddə daha çokdan başlanmьş və Trojadaqьndan daha javaş artmьşdyr. Alimlər; kədim və ɵzunə ƣɵrə xusysijjəti olan mədənijjət mərqəzinin haman byrada, Qriddə oldygyny, Miqen və Trojanьn mədənijjətləri isə ancak Qrid mədənijjətinin gejri-muqəmməl və daha qasьb əqsi-sədasь oldygyny kəbyl etməƣə məcbyr oldylar. By elmi axtarьşlarьn hamьsь alimləri daha bɵjuq nəticələrə ƣetirib çьkartdь: Qrid mədənijjətinin Iljada mədənijjəti ilə heç bir əlakəsi jokmyş. By mədənijjəti jaradan insanlar hətta jynanlar belə dejilmiş. Alimlərin karşьsьnda Homer epoxasьndan kabak çok kədim zamanlara ajid tamam jeni bir aləm açьlmьşdyr: by aləmin kədimliqi və davam etməsi Mьsrьn kədimliqindən ƣeri kalmajьrdь. By aləm bir çok mutəvali etaplar qeçirərəq, tamamilə mustəkil olarak inqişaf edirmiş; və nihajət haradansa şimaldan Adalar dənizi sahillərinə ƣəlmiş barbar bir tajfanьn hucymy ilə dagьdьlmьşdyr, və Qrid mədənijjəti xarabalarь ustundə daha sadə kyrylyşly jeni bir jaşajьş kyrmyşlar. By qəçub ƣələnlər „barbarlar“ haman jynanlar imiş; Iljada haman bynlarьn hərbi dəstələrinin jaşajьşlarьnь təsvir edirmiş. Bir zamandan sonra, hətta jynanlarьn ɵzləri, hansь tajfanьn ɵlqəsinə ƣəlib məsqən saldьklarьnь ynytdylar; onlar tarixlərinin umymijjətlə Homer jaşajьşьndan başlanmasьna inanmьşdьlar. Knos haqimləri hakkьndaqь karanlьk xatirələri isə onlarьn ɵz tarixləri ilə karьşmьşdь və nagьllarda sɵjlənən Minos adilə əlakədar olmyşdy.

Mədənijjətin elm tərəfindən təsbit edilmiş dəjişilməsi sxematiq bir syrətdə by aşagьdaqь cədvəl şəqlində ƣɵstərilə bilər:

| TROJA | MIQEN | QRID |
|---|---|---|
| 9. Təzə Ilion (Roma epoxasь). | | |
| 8. Qənt. | Təkribən miladdan 1200 il kabak Qrid mədənijjətinin dagьdьlmasь. | |
| 7. Qənt. | | Sonraqь Qrid epoxasь |
| 6. „Homer Trojasь“ | Miqen məkbərələri | Orta Qrid epoxasь, Labirint. |
| 5. Qənt. | | |
| 4. Qənt. | | |
| 3. Qənt. | | |
| 2. „Şliman Trojasь“. | | Təzə-Qrid epoxasь. |
| 1. Neoletiq qəçub jerləşmə. | | Neoltiq mədənijjəti. |

By syrətlə by mısal uzərində arxeoloƶi elmi mədənijjət tarixinin ən kədim epoxalrьnь tədkik etdiqdə, istifadə elədiqi metody ajdьnlaşdьrdьk. Insana mədənijjətinin kalьklarь bir-birinin ustə katkat dɵşənmişdur; toprak altь mədəni katlarь ɵzlərində insan fəalijjətinin maddi xatirələrini (şəhadətnamalarьnь) muhafəzə etməqdədur. Abadanlьk, tiqili, alət və sənajei-nəfisə əsərləri tiplərinə ƣɵrə butun mədənijjət tarixini bir sьra ajrь-ajrь epoxalara bɵlməq və hər bir epoxaja muəjjən karakteristika verməq olar. Muxtəlif məhəlləri bir-biri ilə mukajəsə etməq və bynlarьn bir-birinin ygyn ja inqi bil'əqis həmin məhəllərdə tapьlan mədəni kalьklarьn muxtəlif zamanlara ajid oldyklarьnь tə'jin etməq olar. By kədim əsrlərdə çokdan məhv olmyş mədənijjəti açmaga; olanlarьn təræməsini, artmasьnь, coƣrafi intişarьnь və nihajət pyç olmasьnь, dalba-dal ɵjrənməƣə imqan verir.



Ƣeoloƶi də byna okşar metoddan istifadə edir. Laqin ƣeoloƶi jerin tarixinin hələ qi, insan jaşamajan epoxasьnь da tədkik edir. Jerin kabьgьnьn katlarьnda ƣeologyn ɵnunə tədric ilə nəbatat və hejvanat həjatьnьn daş olmyş kalьklarь çьkьr. Ƣeolog by kalьklara ƣɵrə uzvi qainatьn təqamulunun ƣedişini jenidən kyra bilir, və er qurrəsinin butun tarixini bir sьra ajrь-ajrь devrlərə bɵlə bilir.

Jynanьstanьn ən kədim tarixi uçun Şliman etdiqini, uzvi qainatьn tarixi uçun məşhyr frənq alimi Quvje etmişdi. Quvje XIX-əsrin əvvəllərində Paris ətrafьndaqь jerlərin katlarьnь tədkik etdi. Monmartr təpəsinin cibs katlarьndan bir sьra məhv olmyş hejvanlarьn isqeletlərini çьkartdь; bynynla o munkəriz olmyş və jerin dərinliqlərinə ƣɵmulmuş butun bir organizim aləmi qəşf etdi. By syrətlə Quvje munkəriz olmyş hejvanlardan bəhs edən elmin-paleontoloƶinin əsasьnь kyrdy. Amma bynynla barabar ƣeoloƶinin karşьsьnda jeni və çətin bir məsələ kalkdь: qeçmişdə organizmlərin nə səbəbə munkəriz olmalarьnь və jalьnьz jerin ɵzunun dejil, onyn uzərində jaşajanlarьn da nə səbəbə dəjişildiqlərini izah etməli idi.

## TORFLYKLAR NƏJI ƢƟSTƏRIR?

Torflyklarьn kyrylyşy ilə aşna olak və ƣɵrəq qi, onlar bizim ɵlqəmizin tarixi hakkьnda nə ƣɵstərə bilərlər.

Hər bir hoyz, hər bir ƣɵl təşqil oldygy andan bitqi ilə ɵrtulməƣə başlajьr. Bir tərəfdən by jerlərdə artьk mikdarda sallanmьş halda olan muxtəlif ibtidai bitqi organizmləri artьr; bynlarьn olmagьndan sy bylanьr və çok vakt syjyn ɵzu „çiçəqlənir“. By organizmlər ɵlərəq syjyn dibinə tequlur, və orada çuruməƣə başlajьr; laqin oksiƶenin azlьgьndan by çuruməq axьra qibi davam etməjir və ƣɵlun dibində jarь çurumuş organizm lili biriqir. Diƣər tərəfdən, ƣɵlun uzərinə haman ƣɵlun sahilindəqi saz, kamьş qibi nəbatat irəliləjir; bynlarьn dalьsьnca ƣɵlun uzərinə cil, iris, ƣɵj zanbak, sy sarьmsagь hucym etməƣə başlajьr. Ƣɵl javaş-javaş batak (battak) halьnь alьr.

Iqi tip batak vardyr: uzu kalьn ot ilə ertulu **otly** və ja **çykyr batak** və **josynly ja inqi dəbərmiş batak**. Birincilərin bitqiləri arasьnda muhum rol ojnajan jaşьl **hipnym** josynydyr: iqincilərin bitqilərindən ən muhummu ag sfagnym josynydyr. Ag sfagnym; sylarь az əhənqi olan bataklarda daha çok olyr. Ag sfagnym qelun sahillərini halka qibi çevirir, və ildən ilə onyn ortasьna dogry jerijir. Yzyn dil şəqlində syjyn içinə dogry yzanьr və bir neçə ildən sonra qelun uzunidə titrəjən taklabьk pərdəsini təşqil edir.

Hər il tələf olan və syjyn dibində çurumaməqə mə'ryz kalan batak bitqilərinin kalьklarь javaş-javaş torfa çevrilir və aşagьdan jykarьja dogry qelun çykyrlygyny doldyryr. Çyxyr torf ilə doldykca, onyn uzu kalkьr və zəmin sylarьnьn səvijjesindən yzaklaşьr, juqsəlir, kabakda sy çyxyry olan jerin duzəlmiş uzu kyrymaga başlajьr. Indi byradan ancak inqişafь uçun çok şərajit lazьm olmajan sfagnym josyny arta bilər; by josyn jagьşdan aldьgь nəmlə qifajətlənir, lazьm olan mineral maddələrini jel qətirən toz hissəciqlərindən alьr, tez boj atьr, dert tərəfə jaibьr; by syrətlə kabarьk torf məhəlli əmələ qəlir. By torflyk vaktilə qel olan çyxyr jerin uzunu tamamilə ertur.

Ot basan qellərdə muxtəlif gryp bitqilər muxtəlif dərinliqdə



Şəqil-2. Muəjjən syrətdə bir-birinin dalьsьnca ot bitən qeldəqi bitqilərin zonalarь: cil, katьr kyjrygy, saz, kamьş, sy zanbaklarь, sy josynlarь.

bitir; və byna qerə də bitqilər sahil bojynca kyrşak halьnda və ja zonlar ilə duzulurlər (*şəqil*-2); umymijjətlə lap kьrakda cil və batak katьr kyjrygy bitir; bir kədər artьk dərində sazlar, kamьşlar jerləşir; bynlarьn dalьsьnca, məsələn, sy zanbagь və nilyfər qibi japraklarь syjyn uzundə uzən bitqilərin zonlarьnь qerməq olar; bynlardan sonra həmişə syja batmьş sy bitqiləri qedir və nihajət daha dərin jerlərdə ancak sy josynlarь jaşajьr. Butun by bitqilərin kalьklarь çuruduqdə; muxtəlif dərinliqdə, muxtəlif tərqibdə torf əmələ qəlir; hyna qerə də cil torfy, saz torfy, kamьş torfy qibi muxtəlif cinslərə ajrьlьr; o maraklьdyr qi, qelun dibində bitqi kalьklarь biriqdiqcə, qelun dibi juqsələn qibi olyr və



qelun dərinliqi azalьr. By halda bitqilərin gryplarь hərəqət etməlidurlər: sazlar sy zanbaklarьnьn jerini dytyr və onlarьn zonasьna isə kamьş, cil qeçur. Umymijjətlə butun bitqilər qelun ortasьna dogry ilərilәjirlər və qel dajazlandьkca bir-birinin dalьsьnca muəjjən syrətdə təqcə cillər kalaıa qibi hamьsь tələf olmaga başlajьr və ancak cillər sabik qelun ustunə jajьlьr. Indi əqər torfyn bir jerindən şakyli bir sutyn qəssəq, haman byrada katlarьn muəjjən syrətdə dal-ba-dal duzuluşundə torflygyn tarixinin jazьldьgьnь qerə biləriq; haman katьn aşagьsьnda kamьş, ortasьnda saz və jykarьsьnda cil torfy qerunur.

Indi bizim torflyklarьmьzьn tarixini „okymak" uçun by muşahədələrin hamьsьndan istifadə edəq Misal uçun Leningraddan yzak olmajan jaxşь tədkik olynmyş Şyvalov torflygyny qeturəq; byranьn torfynyn kalьnlьgь by katlardan ibarətdur (jykarьdan aşagь):

8— Hal-hazьrda da bəjuməqə, bitib-artmaga davam edən (2—3 metro) və az çurumuş ust cavan sfagnym torfy, bə'zən bynda qiçiq dijametrli şam agacь qetuqləri rast qəlir.

7— Ust katdan jaxşь seçilən və javaş-javaş alt kata qeçən torfyn „hudyd gorizonty"; by nev' torf bərq çurumuş olyr, bynda çok vakt şam agacьnьn iri qetuqləri və qejdələri (10-20 *sm*.) tapьlьr.

6— Qehnə sfagnym torfy; by, bərq çurumuş və agac kalьksьz (50—70 *sm*) olyr.

5— Odyncak kalьksьz xalis qipnym torfy (10—40 *sm*);

4— Bir-birinin ustə təqulub sьk jьgьlmьş kamьş saklarьndan və japraklrьndan əmələ qəlmiş kamьş torfy (12-15 *sm*);

3— Kьzьl agac, toz agacь, bydaklь cil qipnym torfy (8—12 *sm*); həmin byrada bodyr toz agacь kalьgьna rast qəlməq olyr.

2- Qel lili katь;

1— Kym.

By sajьlan katlar qyja qi Şyvalov torflygynyn „tarixini" qestərir; alt katlar (6—3) torflygyn necə əmələ qəlməsinin və ez karakterini javaş-javaş dəjişməsinin şəqlini çəqir; kym binevrəsi (1-*ci kat*) uzərində lap kabakca qel əmələ qəlmişdur (2-*ci kat*); by torflygyn muxtəlif jerlərində aparьlan kazma işləri haman qelun qiçiq oldygyny qestərdi; qel lili katь, indi torflygyn dytmyş oldygy butun by səhəni doldyrmakdan çok yzakdyr. Qelun kьraklarьnda kьzьl agac və toz agacь bitirmiş; qerunur qi, nəmişliq qet-qedə artьr və meşəni batak basьrmьş; cil və qipnym əmələ qəlməqə başlamьş (3 *cu kat*). Meşənin jerində əvvəlcə kamьş (4-*cu kat*) və sonra qipnym (5 *ci kat*) batagь əmələ qəlmişdur. Josyn javaş-javaş batagьn uzunu ertmuş və onyn uzunə dogry sfagnym ilərilәməjə başlamьşdyr (6-*cь kat*) və ən nihajət javaş-javaş ətrafa jajьlan kabarьk torflyk əmələ

qəmişdur. Torflygyn daha sonraqь tarixində 7-ci kata yjgyn olan bir devri də kejd etməq maraklьdyr: qərunur qi, sfagnymyn artmasь muvəkkəti olarak dajanmьş, batak kyrymyş, torfyn ust hissəsi çurumuş və torflygyn uzu kəşənq şam agacь meşəsilə ərtulmuşdur. Laqin bir neçə vaktdan sonra byranьn iklimi daha rutybətli olmyş və sfagnym jenidən artmaga başlamьşdyr. Hal-hazьrda da cavan sfagnym tərfy bəjuməqə davam etməqdədur.

By syrətlə Şyvalov torflygynyn katlarьnda iklimin dəjişməsinin tarixi jazьlmьşdyr: əvvəlcə, qet-qedə artan rutybətliq əvəzinə bir neçə vakt kyraklьk olmyşdyr. Byndan başka Şyvalov torflygynyn alt katlarьnda kutub bitqiləri cinsindən olan bodyr toz agacь **(Betula nana)** kalьgь haman torflygyn əmələ qəldiqi zamanlarьn əvvəllərində by jerin bərq sojyk iklimli oldygyny qəstərir. Haman toz agacьna indi də Leningrad gybernijasьnda (və hətta bir kədər də cənyba dogry) torflygyn uzundə təsaduf edilirsə də ancak o zaman (*3-cu kat qəstərdiqi qibi*) dogrydan-dogryja mineral zəmin ustundə bitirmiş. Deməli qi, Şyvalov torflygy əmələ qələn zaman, təsvir olynan jerdə bərq kutub iklimi var imiş.

By sonyncy nəticənin durust olmasь çok kalьn və daha kədim olan Almanja, Danimarka və Isveç torfylyklarьnь tədkik etdiqdə daha ajdьn syrətdə təsdik olynyr. Birinci dəfə olarak kutub bitqilərinin kalьklarьnь (bodyr toz agacь, kutub səju'u və sajirə) Nathorst 1870-ci ildə Isveç torflyklarьnьn alt katlarьnda tapmьşdyr. Byndan da kabak Stenstryp 1842-ic ildə Danimarka torflygynyn tarixinin dikkətli tədkik olynmasьnьn əsasьnь kojmyşdyr. Torf təbəkələrinə altdan jykarь dal-ba-dal bakdьkda və torfyn içində muxtəlif dərinliqdə nəbati suxyrlarьn kalьklarьnь tədkik etdiqdə, o, by fiqrə qəlmiş qi, Baltiq dənizi sahilindəqi ələqələrin hal-hazьr agac bitqiləri byrada birdən əmələ qəlməmişdur; agaclarьn nev'ləri bir-birinin dalьsьnca çьkmьş və Avropa meşələrinin karakteri əsrlər muddətində tədriclə dəjişilmişdur. Hal-hazьrda Danimarka və Isveçdə fьstьk agacь və qyqnar çok bitirsə də torflyk katlarьna ustdən aşagь baksak, floranьn dəjişilməsinin aşagьdaqь kajda ilə oldygyny qərməq çətin dejildur: 5) fьstьk və qyqnar, 4) palьt, fьndьk agacь, 3) şam agacь, 2) toz agacь, və agca kavak. 1) kutub toz agacь, kutub səjudu. Deməq qi, jykarьda bylynan və isti sevən fьstьk agacь və palьt, lap altda kutub toz agacь ilə əvəz olynyrlar. Ajdьndyr qi, qeçmiş zamanlarьn dərinliqlərinə dogry qetdiqcə, biz qyja qi, kutub sojyklarь və bitqiləri az olan tyndralar epoxasьna karşь qetmiş qibi olyryk.

Bizim indiqi zamandan çok qeridə kalmьş sojyklar epoxasьnьn xatirələri ilə birinci rast qəlməqimiz belədur.



## SIBIR NƏJI QƏSTƏRIR?

Şərki Sibir, butun təbiəti şiddətli sojyk iklimin tə'siri altьnda təşəqqul etmiş bir ələqədur. Alçak temperatyranьn jerin landşaftьna (mənzərəsinə) olan tə'sirini tədkik etməq bir misal olmak uzrə Sibir ilə tanьş olak.

**Daimi donlyk.** Çokdan mə'lymdyr qi, byrada toprak altьnda daimi donmyş, heç vakt əriməjən katlar vardyr. By barədə Sibir ilə aşna olmak uçun Moskva hequməti tərəfindən qəndərilən XVII-əsrin cənqavərləri əz hakk-hesablarьnda xəbər verirdilər. Bynlardan birisi olan Pjotr Golovin belə jazьrdь: „Alьş-verişçilərin və kyllykçylarьn səzlərinə qərə Jakytskda taxьl zəmisi olmagьnь fiqrə də qətirməq olmaz; byrada toprak jajьn ortasьnda da tamam əriməjir"; bəjuq Pjotr tərəfindən Sibirə qəndərilən birinci elmi ekspedisja daimi donlyk hakkьnda birinci xəbəri qətirmişdi. Sonra 1771-ci ildə Vilju çajьnьn qənarьnda donmyş toprakda jaxşь muhafəzə olynmyş tuqlu qərqədənin cəsədi tapьlmьşdyr və 1799-cy ildə də kutub dənizinin kьragьnda, Lena çajьnьn mənsəbi jakьnlьgьnda mamont cəsədi tapьlmьşdyr. By tapgьlar elmdə bəjuq rol ojnadь. Məşhyr fransьz alimi Quvje jə qətirilən və mamontyn fil grypyndan oldygyny tə'jin etməqə imqan verən mamont şəqli, elmdə bə'zi hejvanlarьn tamam məhv oldyklarь hakkьndaqь məsələni nevbəjə kojdy və vaktdan-vakta jer qurrəsini sarmьş olan və uzvi qajinatь məhv edən dunja mikjasьndaqь katastroflar hakkьndaqь nəzərijjənin jaranmasьna qəməq etdi. 1842-ci ildə Elmlər akademjasь Sibirə bəjuq ekspedisja qəndərdi; bynyn qərəcəqi vəzifələrdən biri də daimi donlygy tədkik etməq idi. Ekspedisja rəhbəri Midden Jorf, Jakytskda tacir Şerqin tərəfindən kazьlmьş kyjyny tədkik etdi. Kyjynyn dərinliqi 110 metrony qeçirdi. Laqin donmyş katdan hələ əttməmişdi. Sonralar XIX-əsrin axьrьna qibi daimi donlyk hamьnьn nəzəri-dikkətini jenidən əzunə cəlb edənə qibi, daimi donlyk məsələsi az iləriləjirdi. Sibir dəmir jolynyn çəqilməsi muhəndisləri təbiətin by qizli hadisəsi karşьsьnda kojdy. By məsələ ilə aşna olmamak, çok baha otyrdy: qah bəjuq daş tiqililər, qərunuşdə səbəbsiz çəqurdu, qah dəmir jol qəprulərinin dajaklarь təprənirdi, qah çykyr və ojyklar dolyrdy; byndan başka stansijalarьn sy ilə təchiz olynmasь məsələsi də çok muhum idi; çunqu donmyş toprakda kazьlan adi kyjylar ilə məksədə çatьlmajьrdь.

Toprak altьnda daimi donmyş katьn əmələ qəlməsinin umymi səbəbləri iklim şərtlərindən asьlьdyr. Jerin kabьgьnьn ust katlarьnьn temperatyrasь onlarьn qunəş ilə nə dərəcədə kьzdьrьlmalarьndan asьlьdyr. Byna qərə də, topragьn temperatyrasь biri qunluq, o biri illiq olmak uzrə iqi nev' periodiq dəjişməqə tabe' olmalьdyr. Muşahədələr dogrydan da qəstərmiş qi, ust katьn

temperatyrasь bir qun içərisində maksimymdan (qun ortadan bir kədər qəçmiş) minimyma (qunəşin çьkmasьna bir kədər kalmьş) kədər dəjişilir. By qundəliq dəjişmələr katdan-kata qeçib jerin dərininə qedir; laqin dəjişmə amplitydlarь dərinə qetdiqcə o kədər qiçilir qi, muəjjən bir dərinliqdə termometro temperatyra dəjişmələrini qөstərməjir. By katda kojylmyş termometro tamam bir qun içərisində dəjişməjən bir temperatyra qөstərəcəqdur. By kat sabit, „qunluq temperatyra katь" adlanьr. By kat 1—2 metrodan artьk dərinliqdə olmajьr.

Illiq dəjişmələr topragьn daha dərininə işləjir və onlarьn amplitydlarь da dərinliqdən asьlь olarak azalьr. Byndan başka dəjişmə periodlarьnьn hər bir dərinliqdə sabit kalmalarьna bakmajarak, illiq maksimym və illiq mininmym başlama zamanlarьnda qeciqmə qөrunur. Belə qi Japonjadaqь muşahədələrə qөrə orada 0,6 m dərinliqində maksimym avgystyn 21-ndə, 3 *m* dərinliqdə nojabirьn 6 sьnda, 5 *m* dərinliqdə fevralьn 2-sində, 7 *m* dərinliqdə aprelin 30 nda olyr. Minimym da həmçinin həmin dərinliqlərə muvafik janvarьn 31-ndə, majьn 3-ndə. ijylyn 30-nda, oktjabrьn 30 nda olyr. Qunəş istisinin topraga qeçməsinin belə qeciqməsi, bir kədər dərində ilin mevsimləri jerin uzərindəqi mevsimlərin əqsinə olmasьna səbəb olyr. Jerin uzundə isti jaj olanda, 5 *m* dərinliqdə toprak altь kalь kьş sojygy qeçirməqdə olacakdyr.

Byradan ajdьndyr qi, muxtəlif dərinliqlərdə ajrь-ajrь mevsimlərdə muxtəlif temperatyralara təsaduf edəcəqiz. Odessada edilən muşahədələr uzərinə tərtib edilmiş olan aşagьdaqь cədvəldən qөrunur qi, janvarьn 15-ndə dərinə qetdiqcə, temperatyra kalkьr və ijylyn 15-ndə isə duşur. Aprelin 15-ndə daha sojyk kat iqi isti katlar arasьnda, oktjabrьn 15-ndə isə daha isti kat iqi daha sojyk katlar arasьndadyr.

| | | Dərinliq metro ilə | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | 0,4 | 0,8 | 1,6 | 2 | 2,5 | 3,2 |
| Janvarьn 15-də | Temperatyralar | 0,6 | 2,8 | 6,6 | 8,3 | 9,7 | 11,8 |
| Ijylyn 15-də | | 20,8 | 19,1 | 16,4 | 15 | 13,3 | 12,2 |
| Aprelin 15-də | | 7,8 | 7,2 | 6 | 6,2 | 6,6 | 8,1 |
| Oktjabrьn 15-də | | 11,8 | 14,9 | 17 | 17 | 16,3 | 15,8 |

Illiq dəjişmələrin amplitydy dərinə qetdiqcə əjsildiqinə qөrə, bir kədər dərində „sabit illiq temperatyra katь" olmalьdyr. Byrada illiq dəjişmələr o kədər qiçiq olyr qi, onlarьn mikdarlarь muşahədə zamanьnda bila-aixtijar byrakьlan səhvlərdən də əjsiq olyr. By kat orta hesab ilə 15—30 *m* dərinliqdədur. Laqin by dərinliq dag suxyrlarьnьn fiziqi xassələrindən (onlarьn istiliqi çok və ja az qeçirməq



xassələrindən) və jerin uzundəqi dəjişmələrin amplitydyndan (kontitental əlqələrdə amplityd dəniz qənarьndaqь əlqələrdən daha dərində və tropiq əlqələrdə kutbi əlqələrdən jerin uzunə daha jakьnda olyr) asьlьdyr. By katьn temperatyrasь təkribən həmin məhəldə jerin uzundə olan illiq orta temperatyraja musavidur. Indi ajdьndyr qi, bir məhəllin illiq orta temperatyrasь 0°-dən aşagь oldykda, həmin əlqənin altьnda daimi donlyk katь olacakdyr. Sibirdə də iş by curədur.

Daimi donmyş katьn olmasь, Sibirin butun təbiətinə muəjjən tə'sir byrakmьşdyr: çajlarьn və onlarьn işlərinin karakteri, topragьn ərtuqu və bitqi—bynlarьn hamьsь Sibirin altьnda olan daimi donlyk şərtlərindən artьk dərəcədə asьlьdyr. Belə qi. Sibir çajlarь ajdьn bir syrətdə iqi tipə bөlunə bilər: Gərbi Sibir (Ob və onyn kollarь) və Şərki Sibir çajlarь (Lena, Amyr və gejriləri).

Gərbi Sibirdə kьşda çok mikdarda kar biriqir; amma byrada topragьn altьnda (Kutub dənizinin qənarьndan başka) daimi donlyk jokdyr. Jazda kar tez ərijir; ərimiş sylarьn bir hissəsi çajlara qedərəq, onlarьn sylarьnь kaldьrьr: diqər hissəsi isə maneəsiz bir syrətdə toprak tərəfindən hopylarak jer altь sylarьna çevrilir. Jer altь sylarьnьn bol olmasь, jaj muddətində çaj sylarь səvijjələrinin muntəzəm mikdarda kalmasьna jardьm edir. Byna qөrə də balaca dəjişmələr nəzərə alьnmazsa, altь ajlьk jaj mevsimində ta avgysta qibi çaj sylarьnьn nisbətən juqsəq səvijjələri ejni bir mikdarda kalar; az jagьşlь və kyraklьk qeçən jaj mevsimində çajlar daşmajьr. Avgystdan başlamьş sylarьn səvijjəsi duşməqə başlajьr və kьşda ən alçak səvijjəjə çatьr. Bynyn əqsinə olarak Şərki Sibirdə az karlь kьş bөjuq jaz daşkьnlarь ilə kyrtara bilməjir. Byrada xьrda çajlarda çok vakt hətta byz kьrьlmasь da olmajьr: byzyn ustu sy ilə ərtulərəq javaş-javaş jerində ərijir. Diqər tərəfdən sy byrakmajan daimi donlyk, jagьş sylarьnьn topraga, çok dərinə hopmasьna imqan verməjir. Byrada çajlara akan sylar jerə hopan sylardan çokdyr və byrada bərq daşkьnlarьn olmamasьnьn başlьca səbəbi, az karlь kьşdan sonra ərimiş kar sylarь çok az olmasьdyr. Bynyn karşьsьnda jajda jagьş sylarьnьn deməq olar qi, hamьsь çajlara akarak tez-tez daşkьnlar tөrədir. Jer altь sylarьn azlьgь, çajlarьn intizamlь bir syrətdə bəslənməsini tə'min edə bilməjir və ilin isti jarьsьnda çaj sylarьnьn səvijjəsi ancak daşkьnlardan asьlь olarak çok dəjişilir.

Şərki Sibirdə xusysən „byz dytmalarьn" əmələ qəlməsi maraklьdyr. Şostakoviç dejir qi:

„Kьşda" byz dytma" qəlməsindən donmyş tebiətin ortasьnda gəflətən akar ja dyrar syjyn mejdana çьkmasь anlaşьlьr. By sy, jerin uzunu ərtən kar əruqə hopyr: donmyş çajlarьn məcralarьnь və butun dərələri basьr. Jajda Jakyt mintəkəsində „byz dytma" metrolar ilə kalьnlьgь və bir neçə qilometro sahəni ihatə edən cəsim byz çəlləri təşqil edir; bə'zən by byz çəlləri bitqi xalçasilə çiçəqlənmiş və tac şəqlində haşjalanmьş on kvadrat qilometrolarla jeri ihatə edir. Belə bir tərəfdən çajla-

rь diblərinə kədər dondyran 40 gradys şaxta, diqər tərəfdən darələrin daşmasь, 35 gradys isti və byz çelləri qibi, birləşməsi mumqun olmajan təbiət hadisələrini ɵzundə birləşdirən „byz dytma“ hadisəsi, by qibi hadisələrə alьşmamьş olan sijahətçilərə qəribə və təbiətin təzadlarь qibi qɵrunur“.

Byz dytma hadisəsinə səbəb, daimi donlykdyr. Kьşda çaj byz ilə ɵrtulduqu və dərənin topragь da ustdən dondygy zaman dərənin dibini təşqil edən qevşəq jьgьntьja hopan jer altь sylarь, sy qeçirməjən iqi təbəkə arasьna sьkьşmьş olyr. By təbəkələrdən altdaqь həmin daimi donmyş katdyr. Çajda byz artdькca, çaj syjy akan arx daralьr. Syjyn təzjiki artar. Sy jьgьntь katlarьna hucym edir və alt donlyk katь çok mɵhqəm isə onda sy mumqun olan jerdən ust donlyk katьnь dəlir və karlarьn və byzlarьn ustundən daşarak dərəjə çьkьr. Bə'zən „byz dytma“, çaj olmajan jerlərdə də əmələ qəlir; by halda onlarьn əmələ qəlmələrinin səbəbi jer altь sy akьntьsьdyr; kьşьn sojygy ustdən və daimi donlyk altdan syjyn hərəqətini saklajarak, ony ɵzunə bir jerdən jol tapьb çьkmaga məcbyr edir. Əqər məhəl tamamilə duz isə, o zaman kьşda əmələ qəlmiş byz adalarьnь ancak jajьn isti şua'larь kova bilər. Byz dytmalar çajlarьn adi akьmlarьnь dəjişdirə bilir. Onlar çajlarь kədim jataklarьndan çьkarьb qɵzlənilməjən bir tərəfə akmaga məcbyr edir. By halda, birdən ɵz akьm istikamətini dəjişən çaj, ɵz lili ilə ɵz byzyny çəqib apara bilir. Əqər qɵdəciq Sibir jajь ərzində by jьgьntь kat kьzmazsa, onyn altьnda naziq təmiz byz katь kalacakdyr. By kajda ilə daimi donlyk dajirəsində çok zaman toprak katlarь ilə byz katlarьna biri-biri uzərinə nevbə ilə duzulmuş bir halda təsaduf ədilməsi bynynla izah edilir. Jer altь syjy donyb jerin uzunə çьka bilmədiqdə, tez-tez jer altь byz katь əmələ qəlir. Belə jerlərdə topragьn dəbərməsini və 3 metroja kədər juqsəqliqdə təpələr əmələ qəlməsini kejd etməq olyr. Belə jerlərdə bitən agaclarьn qɵjdələri jatьk vəzijjət alьr. By təpələr altьnda 2 metro kalьnlьgьna kədər linza qibi byz çьkarьla bilir. Bynlar bylaklar donykda əmələ qəlir və jajda çɵqurlər.

Səthləri duz olan jerlərdə asanlьkla batak əmələ qəlir. Donlyk sy byrakmaz bir kat qibi tə'sir edərəq, toprak rutybətinin biriqməsinə səbəb olyr. By topragь sojydarak atmosferdən rutybətin çəqməsinə jardьm edir və nihajət jajda ustdən ərijərəq jenə də topragьn syjyny çokaldьr. Bynlarьn hamьsь bɵjuq bataklarьn (Amyr dajirəsində) „marej“ əmələ qəlməsinə səbəb olyr.

Donlykda ancak japraklь kara şam agacь bitə bilir. Bynyn qɵqləri dərinə işləməjir və daha artьk ufki səth uzrə jajьlьr. Byna qɵrə də by agaclar quləq olanda dəstə-dəstə jьkьlьr. Hejvanlar da donlyga ɵjrəşir və avçьlarьn qɵstərişlərinə qɵrə adət uzrə dəlməqlərdə (jyvalarda) jaşajan hejvanlardan bə'ziləri byralarda jyvalarьnь agaclarьn kogyşlarьnda kyryrlar.



Daimi donlyk katьnьn həm dərinliqi, həm də kalьnlьgь muxtəlif jerlərdə çok muxtəlif, olyr. Daimi donlygyn olmasьnь tə'jin edən umymi şərtlərdən — orta illiq alçak temperatyradan — başka, umymi donlyk bir sьra məhəlli şərtlərə də tabe'dur. Belə qi, həmin məhəldə kar ɵrtuqunun kalьnlьgь nə kədər az olsa, donlyk bir o kədər daha bərq olyr. By səbəbə də Qərbi Sibirdə kar ɵrtuqu kalьn oldygyndan byrada donlyk jokdyr; laqin donlyk katь kьşь az karlь olan Mongolja altьnda vardyr. Kejd olynmyşdyr qi, jagьş syjy. donlygy „aşьndьrьb“ dərinə salьr; çunqu syjyn isti dytymy çok oldygyndan, sy topraga çokly isti verir. Byna qɵrə də hərəqət edən jer altь sylar donlygy azaldьr. Laqin jer altь syjynyn dajanmasь donlygyn əmələ qəlməsinə jardьm edir. Byzyn isti qeçirməq kablijjəti syjynqyndan artьk oldygyndan, ɵzunə çok sy çəqmiş topragьn ust katlarь dondykda, kьşьn sojygy daha dərinə işlər; əqsinə, jajda toprak dondan açьlmaga başladькda, byz istini daha az qeçirən syja çevriləcəq və ərimiş toprak syjy istinin daha dərinə işləməsini çətinləşdirəcəqdur. Xysysən jerin uzunu ɵrtən josyn ja inqi torf, daimi donlygy qucləndirir və onyn jer uzunə daha jakьn təbəkələrdə əmələ qəlməsinə səbəb olar. Daimi donlyk uçun josyn torflyklarь qunəş şua'larьnьn topraga qirməsinin ɵnunu alan ən ymydly sipər sajьla bilər.

Jykarьda sɵjlədiqimiz kьş minimymynyn dala kalmasьnь nəzərə aldькda, daimi donlygyn hansь dərinliqdə oldygyny tə'jin ətməq çok vakt asan olmaz: jajda donmyş tapdьgьmьz toprak katьnьn ancak bir neçə aj qeçəndən sonra ərimәsi mumqundur. Laqin temperatyranьn illiq dəjişmələri çatmajan dərinliqdə donlyk tapar isə, by katь biz „daimi“ donlyk katь sajmaga hakkьjьk.

Çok ehtimal qi qəhnə zamanlarda bizdə Avropada. Baltiq dənizinin qənarlarьnda da kutub bitqiləri bitirmiş və Sibirdə də toprak lap uzdə daimi və sabit donlyk halьnda imiş. Ola bilsin qi, qɵdəciq kutub jajь ərzində byrada hal-hazьrda ancak byz dytmalarьn və Amyryn bə'zi jerlərində qɵrunən həmin hadisələr bɵjuq mikjasda əmələ qəlirmiş. Başka sɵz ilə, indi tajga ilə ɵrtulu olan butun Sibir o zaman tamam tyndradan ibarət imiş. Indi iklim o kədər jaxşьlamьş qi, daimi donlyk dərin toprak altь katlara qizlənmişdur və ancak əqs etmiş bir syrətdə ɵlqənin cografijasьna tə'sir etməqə davam etməqdədur. By syrətlə biz, Sibirdə çokdan qeçmiş kutub sojyklarь devrində Avropa uçun də umymi kanyn sajьlan şərtlərin muryri-zaman ilə itməq uzrə bylynan izlərini tapьrьk.

**Jerdən çьkarьlan byz**[1]). Sibirdə çok kədim zamanlardan kalmьş bir maraklь xatirə daha muşahədə etməq mumqundur. Şimali Sibir sahillərinin bə'zi jerlərində və jeni Sibir adalarьnda ustdən jь-



Şəqil-3. Jeni Sibir adalarьnda jerdən çьkarьlan byz.

gьntь (bitqi topragь) katь ilə ərtulmuş 120 *m* kədər kalьnlьkda təmiz byz katlarь tapьlmьşdyr (*şəqil*-3) By byz „daş" byz ja inqi jerdən çьkarьlmьş byz adlanmьşdyr. Hal-hazьr iklim şərtləri by byzyn mənşəini bizə izah edə bilir. Şəqsiz qi, by byz qəhnə epoxa kalьgь və qeçmiş cografi şərtlərinin saklanьlmьş xatirəsidur. Kabaklarda Sibirin daha çok sahəsi belə byz katlarь ilə ərtulu oldygyny fiqrə qətirə bilərik və byzyn butun Sibiri başdan-başı ərtməjib ancak ajrь-ajrь adalar və ləqələr şəqlində olmasь ancak əlqənin ikliminin umymi kyraklьgьndan iləri qəlmişdur; byranьn jagmьrь butun əlqənin byz ilə ərtulə bilməsi uçun kabaklarda də çok az idi. Amma jer qurrəsində elə sahələr var qi, orada indi də belə hadisələr daha bəjuq əlçudə əmələ qəlməqdədur. Byndan başka hər çənd Sibirin təsvir olynmyş byzy indi kədim və kalьn byz ərtuqundən təsadufi kalmьş bir kalьgьndan ibarət isə də laqin başka jerlərdə biz indi də hal-hazьr cografija şərtləri içərisində by cur daimi byz biriqməsinin əmələ qəldiqini muşahədə edə bilərik.

Sibirdən Gərbə dogry hərəqət etdiqdə Skandinav jarьm adasьnь qəruruq; bynyn hundur və jastь təpələri daimi byz və kar ərtuqu ilə ərtuludur. Byz saçaklarь by ərtuqu buruməqdə və daglar arasьndaqь dar dərələr bojy ilə Norveç fiordlarьna (dar

1) Muəllif ископаемый = jerdən çьkarьlan terminini jalьnьz lugəvi mə'nasьnda dejil, ejni zamanda qeolozi mə'nasьnda da işlətmişdur. Məsələn ilərdə qərulələcəq qi, hal hazьrda jerin uzərində bylynan bir çəlun kədim zamanda dəniz qibi oldygy mejdana çьkdьkda muəllif by çələ jerdən çьkarьlan dəniz adь verir.

Redaktor.





qərfəzlərinə)[1] dogry enməqdədur. Sonra Atlantiq okjanysyndaqь İslandja adasьnda biz daimi byz ilə ərtulu 13.000 *kv. qlm.* sahəjə təsaduf edirik. Grenland adasьnda biz 1.900.000 *kv. qlm.* sahə dytan butun bir byz daglьgь qəruruq qi, by byz zrehinə mьxlanmьş qibi olan Şimali Amerika takьm adalarь bynyn yzantьsьdyr. Nihajət şimal kutbunun ətrafьnda biriqən butun by byzlara yjgyn olarak Cənyb kutbunda 13.000.000 kvadrat qilometrolyk bir byz sahəsi vardyr.

Aşna olmak uçun by byz çəllərindən Grenlandь qəturəq:

**Grenland byzy.** Grenland başdan başa byz zrehilə kaplanmьş bəjuq bir adadan ibarətdur. Grenlandьn içərisi tamam kar ilə ərtuludur; kar ərtuqunun altьnda byz katь vardyr. Grenlandь ajak xizəqi ilə başdan-başa kət' edən Nansenin şəhadət verməsinə qərə byz daglьgь adanьn ortasьna dogry juqsəlir və kьraklarьna dogry alçalьr. Adanьn mərqəzində byz katьnьn kalьnlьgь 1800 metroja çatьr. Grenlandьn gərb sahilində byzyn kьragь ilə dənizin arasьnda byz ilə ərtulməmiş və battaklьk ilə dytylmyş ənsiz bir zol kalmьşdyr. Enli byz saçaklarь byz qutləsindən ajrьlarak sahil kajalarь arasьnda donmyş çaglajan halьnda dənizə kədər çatьr. Byrada onlardan jeqə parçalar kopyb dəniz sahilindən yzaklaşьr. By byz daglarь ajsberg adlanьr.

Dərt tərəfdən də dəniz ilə ihatə olynmyş Grenlanda çok jagmьr duşur. Laqin gərbdən və şərkdən aşьndьran sojyk dəniz cərəjanlarь Grenlandьn iklimini sərt edir. Byna qərə də jagmьr kar halьnda duşur və onyn mikdarь qun-qundən artьr. Qunduzlər qunəşin istisindən karьn bir hissəsi ərijir və ərimiş sy qecələr jenidən donyr. Byndan başka kar bir jerdə kalьr və əz agьrlьgь altьnda bərqijir; by təzjikdən kar altda qet-qedə şəffaf, bərq byz halьna qeçir və byradaqь jerin kabьgьnьn qələ-qəturunu ərtur.

Amma byzyn hundurluqu hədsiz arta bilməz. Byz qizli plastiqi cisimlərdən sajьlьr. Qərqinliqinə bakmajarak bəjuq qutlələr ilə akьcьdyr. Məsələn, zelendən (paldadan) bir xьrda dag kajьrsak, zele əz şəqlini saklajacakdyr; əqər ondan butun bir təpə kajьrsak, zele o saat jajьlacakdyr. Bynyn qibi Grenland byzy da fasiləsiz artarak adanьn ortasьndan kьraklarьna dogry jajьlьr. Bakdьkda saat əkrəbinin hərəqəti mə'lym olmajan qibi, bynyn da hərəqəti qəz ilə mə'lym olmajьr; laqin byny bir az vakt dikkətli bakmak ilə aşqar etməq mumqundur. Umymijjətlə musavi şərtlər içərisində byz sydan 10000 dəfə javaş hərəqət edir. Laqin daşkьn olan zaman syjyn çoklygyndan asьlь olarak çajьr sur'əti artan qibi, Grenland byzynyn kalьn ərtusu də artьk sur'ət ilə hərəqət edir: onyn saçaklarь bir qundə 30*m.* sur'ətlə irəliləjir.

2 qilometro kədər kalьnlьkdaqь byz katь Grenlandьn das qutləsinə əlbəttə bəjuq təzjik etməlidur. By, əz jatagьnьn suxyrlarьnь parçalajьr və onlarь xьrdalajьb kym və qil halьna qətirir.

Ɵz altьnda donmyş halda bylynan daş parçalarь ilə ɵz jatagьnь cьrmaklajьr və pərdaxlajьr. Ərimiş sylar çatlaklardan by jataga qeçir və byz içərisində yzyn tynellər açarak dənizə dogry ɵzlərinə jol salьr və suxyrlarьn dagьlmasьna jardьm edir. Byzlar və sylar by dagьntь məhsyllarьnь ɵzləri ilə barabar aparьr; bynlara d i b m o r e n i dejilir. Dəniz sahilinə çatdьkda, by materjal byzyn altьndan çьkarak dənizə tɵqulur (*şəqil*-4). By syrətlə bir Grenland



Şəqil-4. Grenlanda byz ilə ərtulu jerlər.

byzynyn qərduqu işdən, Grenlanda jagan jagmьrьn sulb hala qeçib byrada jerin kabьgьnь qəsdiqini, sьgalladьgьnь və jerin kabьgьnьn materjalьnь jeni bir jerə, dənizin dibinə qeçurduqunu qərə biləriq.



Cənyb kutbi kit'əsinin donmasь məhtəşəm bir mənzərə təşqil edir. Laqin byrada byzyn qərduqu iş daha az tədkik olynmyşdyr. Byndan başka cənyb kutbunu kaplajan byz ɵrtuqunun azalmak devrini qeçirməqdə oldygyny duşunməqə əsas vardyr. Kejd olyndygyna qərə, by byz daglьgьnьn juqsəq mərqəzindən muhitinə dogry aramsьz bir syrətdə jykarьdan aşagь suruşən jellər əsməqdədur. By jellər byz əridiqdə əmələ qələn byglarь ɵzləri ilə okjanysa dogry aparьrlar və by syrətlə byzyn illiq azalmasь onyn əmələ qəlməsindən çok olyr; bynyn əvəzində C ə n y b k u t b u n d ə n aparьlan nəmişliq, jakьn adalara çeqir və byralarda kar ɵrtusu artьr. Byza burunmuş jerin bɵjuqluqunu nəzərə alarak və byzyn qundəliq hərəqət sur'ətini 2 *m* qɵturərəq byzyn Cənyb kutbu mərqəzindən kьraklarьna qedib çatmasь uçun 2000 il lazьm oldygyny hesablamak olar. Deməq qi, hətta byzyn artmasьna səbəb olan iklim şərtləri birdən jok olsa belə, jenə də by byz çok yzyn muddət hərəqətində davam edər.

**Dag byzlaklarь (cəmydijjələri).** Grenland və Cənyb kutbu byzlaklarь bɵjuqluqlərinə qərə mustəsna hadisələrdur. Jerin gejri jerlərində daimi byz daha qiçiq jer dytyr. Daimi byzlar ancak yca daglarda kala bilər; byrada alçak temperatyra ony qunəş şua'larьnьn tə'sirindən koryjyr; iklim daha isti və daha kyry oldykca, daimi kar da daha ycada jerləşir. Skandinav jarьm adasьnda ancak yca feldlər sufrə qibi daimi kar katь ilə ɵrtulmuşdur. Artьk jajьlmaga və daha aşagь enməqə byrada ona Norveç sahillərindən qeçən Golfştrom cərəjanь jol verməjir. Ajrь-ajrь byz jyvalarь Alp, Pirenej, Kafkas və sajirə qibi hundur dag silsilələrinin təpələrində jerləşmişdur.

Kyry dag karь, quləq vasitəsilə daglarьn başьndan onlarьn aralarьnda olan çeqəqlərə aparьlьr, və by çeqəqlərdə qevşəq kar əvvəlcə dənəvər, sud qibi ag və sonra məhqəm abь byz halьna qeçir. Çeqəqlərdə biriqmiş byzyn artьgь bogazlar və dərələr ilə aşagь akьr; yzakdan donmyş çajlara bənzər həmin by yzyn byz saçaklarь b y z l a k l a r ь və ja gletçerlər adlanьr (*şəqil*-5). Alp byzlaklarьnьn qundəliq hərəqəti sur'əti 0,5 *m*-dan artьk olmajьr. Byzlagьn dar jatagь birdən-birə enləndiqdə byz qutləsi bojy yzyny çatlajьr. Byz jatagь birdən birə sərt yçyrymla nihajətlənərsə byzda eninə çatlaklar əmələ qəlir. Dagьn jamacь bojynca byzyn qedə biləcəqi jol; byz ərimэsinin, dag jamacьnьn hansь nɵktəsində byz arkasьndan asьlьdyr. Dagьn başьnda, kar çok artьk jagdьkda, byzlaklar çok aşagь enir; və çəmənlərin, meşələrin içindən, adamlarьn mənzillərinin janьndan qeçməq uzrə ɵzunə jol salar. By barədə xusysilə Odly ada və Jeni Zeland byzlaklarь maraklьdyr; bynlar qunun istisinə bakmajarak, həmişə jaşьl və sybtropiq meşələrinə qibi enirlər. Byzlaklarьn tamam əridiqləri jerlər, byzlagьn lildən bylanmьş sylarь çajlarьn başlangьcьnь təşqil edir. Bərq sojyk və nəmişliq illərdə byzlaklar həddən artьk aşagь yzandьk-

larь qibi, isti və kyraklьk illərdə da daglarьn təpələrinə kədər çəqilirlər; by hadisəjə byzlaklarьn kajьtmasь dejilir. Byzlaklar ətəqi-



Şəqil-5. Alp byzlagь.

nə jakьnlaşdьkda, biz byzyn pərdaxlamak və aparmak tə'sirinin nəticələrini qerə biləriq: byzyn altьndan kyrtylan sьgallanmьş və pərdaxlanmьş kajalar, byzlak jatagьnьn ortasь ilə hərəqət edir; by kajalarьn uzu çok vakt şьrьm və cьrmьklar ilə ərtulu və ustlərində çokca qil kym və gejri muntəzəm, laqin qunclərі və janlarь dəjirmilənmiş daşlar (byzlak daşь) olyr. Byz ilə qətirilmiş tyllanmьş butun by materjal jьgьnь çok intizamsьz bir syrətdə bir-birinin ustə jьgьlmьşdyr. Ancak byzlaklar altьndan akan kar, sylarь by yçgyn (təxribat) məhsyllarьnь aşьndьrьr, aparьr və xьrda hissəciqlərini aşagьda çeqdurur. Butun by ə t ə q m o r e n l ə r i bə'zən byzlagьn kabak ətəqini burujən təpə şəqlində olyr. Sonra



Şəqil-6. Byzlagьn jan moreni.



jamac jykarь, byzlak altьnca d i b m o r e n l ə r i qedir. Alp tipli byzlaklarьn dib morenləri (Grenland byzy altьndaqь qibi enli ərtu olmajьb) ensiz və yzyn taxta şəqlində olyr; dag byzlaklarьnda bir də j a n m o r e n l ə r i olyr. Bynlar byzlaklarьn ustundə bojy yzyny hər iqi janьndan yzanan kym və daş cərqələrindən ibarətdur (*şəqil*-6). Bynlar byzlagьn jatagьnь çevirmiş, dag təpələrindən byzyn ustə duşən suxyr parçalarьndan əmələ qələrəq onynla barabar hərəqət edir. Əlbəttə belə morenlər Grenland arasьndaqь byzda jokdyr.

## BYZLAKLAR EPOXASЬ.

Şyralar Ittifakьmьzьn şimal jarьsьnьn, Avropanьn orta və şimal hissəsinin hər jerində dogrydan-dogryja topragьn ja inqi çəquntu ərtuqunun altьnda kalьn sarь-konyr qil katь vardyr. By qil katь da əzundən aşagь olan jer kabьgьnьn daha dərin katlarьnь ərtur. Orta bir hesabla by qilin kalьnlьgь 2 metrodan 5 metroja qibi olyr; laqin bə'zi jerlərdə bynyn kalьnlьgь 30 metroja və xusysilə sy ajrьcьlarь hundurluqlərində daha artьga çatьr. Çaj dərələrində by, heçə də çьka bilər. By qil kat-kat olmajьr və ony tərqib edən qilli və kymly hissələrin çəşidliqinin tamam joklygy ilə seçilir. By qilin içində daşa çevrilmiş hejvanat [1]) kalьgьnьn olmamasь ony qestərir qi, by qil, dəniz və ja qel qibi muəjjən bir sy hevzəsinin dibində əmələ qəlmiş adi çəquntu dejildur, çunqu sydaqь çəquntulər həmişə kat-kat olar. Amma qi by qildə artьk mikdarda gejri-muntəzəm şəqilli, laqin bir kədər sьgallanmьş, janlarь qorşalmьş, qunclərі dəjirmilənmiş iri və xьrda daşlar vardyr. Qil katьnda byzlak daşlarь adət uzrə intizamsьz jerləşmiş halda bylynyrlar (*şəqil*-7). Tərqiblərinə qerə byzlak daşlarь muxtəlif kristallь suxyrlardandyr; bynlarьn arasьnda qul rənqi, ja inqi-kьrmьzь granit, jaşьla çalar diorit, ag ja bənəfşə rənqi kvarsit və sajirə tapmak mumqundur. Byzlak daşlarьnda çok mikdarda olan granit, jer qurrəsinin daş zrehini təşqil edən kədim suxyrlara mənsybdyr və bynyn ustundən muxtəlif kat-kat



Şəqil-7. Byzlak daşь qili.

1) Dogrydyr, bə'zən by qilin içində belə kalьklar tapьlьr, laqin həmişə surtulmus və pərdaxlanmьş parçalar şəqlində olyr. By da ony qestərir qi, by parçalar by qilə duşmədən əvvəl, həmin kalьklar bərq təxribata ogramьşlardyr.

suxyrlar dɵşənmişdur. Ittifakьmьzьn orta hissəsinin altьnda granit çok dərindədur və əlbəttə onyn kojma hissələri bizim byzlak daşьmьzьn içərisinə heç bir syrətlə duşə bilməzdi. Ancak Ykrajnada granitin jerin uzunə çьkdьgь jerləri vardyr; byrada granit çaj dərələrinin diblərində, qənarlarьnda məsələn, məşhyr Dnepr ətəbələrini təşqil edərəq uzə çьkьrlar. Granit Yralda da həmçinin jeqə daglar təşqil edərəq uzə çьkьr. Laqin nə Ykrajnadan və nə Yraldan bizim jerlərə ɋətirilə bilməzdi; by da ondan bəllidur qi, Ykrajna və Yrala dogry ɋetdiqcə, byzlak daşь ɋilində byzlak daşьnьn kədəri azalьr. Əqsinə, byzlak daşьnьn kədəri Finlanda dogry ɋetdiqcə çokalьr. Ajdьndyr qi, Finland bizə byzlak daşьnьn ɋəldiɋi granit qutləli bir sahədur. Bizim çaj daşlarь Finland daglarьnьn kьrьklarьdyr.

Byzlak daşь ɋilinə bakdьkda, bynyn ilə hər il jazda kar əridiqdə bizim quçələrdə əmələ ɋələn lьg arasьndaqь okşar lьgь ɋɵrməməq olmaz. Kьş yzyny kar katьnda biriqən şejlərin hamьsь çɵqur və jerin uzunu gejri-muntəzəm lьg ilə ɵrtur. Ancak by lьgьn və bizim byzlak daşь ɋilinin kalьnlьgь muxtəlifdur. Laqin Grenland byzlagьnьn kьraklarьnь tədkik edtməɋə başladьkda, daha cəsim mikjasda olmak uzrə həmin mənzərəni ɋɵrəriq: byzlak əridiqdə ondan ajrь və xьrda byzlak daşlarь dib moreninin kymy və ɋili tɵqulur və gejri-muntəzəm bir duzuluşlə jeri ɵrtur (*şəqil*-14). By cur gejri-muntəzəm duzuluşu Alp byzlaklarьnьn aşagь ətəqlərində də ɋɵrməq olyr. Biz o nəticəjə ɋəlməlijiz qi, *Şyralar Ittifakьndaqь byzlak daşь, ɋili bir zaman Şimal kit'əsinin bir çok jerini ihatə etmiş, cəsim byzlagьn dib morenindən ibartdur.*

Avropada byzlak daş ɋili bɵjuq bir sahə dytyr. Onyn dytdygy jerin cənyb hudydy Cənybi Irlandijadan və Cənybi Inɋiltərədən qeçir və sonra Avropa kit'əsində Şimali Fransadan, Belçikadan, Orta Almanjadan qəçərəq Karpat daglarьnь dolanьb bizim Şyralar Ittifakьna daxil olyr. Byrada o Dneprin dərəsilə Xerson gybernijasьna qibi enərəq sonra şimala dogry kalkьr; orta Rysja təpəliqlərini dolanarak Don çajьnьn dərəsilə cənyba tərəf enir; byradan Volga bojy təpələrinin gərb jamaclarь bojy ilə qeçərəq Vasilsyrsk janьnda Volga çajьnь kət' edir və əjri-ujru xət uzrə Şimali-Şərkə, Şimali Yrala dogry ɋedir. By ɋɵstərilən hudyddan Şimala dogry olan jerin hamьsь bir zaman Grenland qibi başdan-başa byz zrehilə ɵrtulu idi; by byzyn kalьnlьgь əlbəttə Grenlad byzynyn indiqi kalьnlьgьndan artьk idi.

Ajdьn şej qi, belə byz qutləsi şua'lar qibi fasiləsiz bir syrətdə hər tərəfə akьb jajьlmalь idi. Həmin by hərəqət edən byz, umymijjətlə 800,000 kvadrat qilometro kədər olan dytdygy sahənin mərqəzindən — Skandınavja və Finlanddan ɋil, kym və byzlak daşlarь qibi suxyry yçyryb apardь. By səbəblə Skandinavja dag-



larь 500—600 metro alçaldь və həmin daglardan aparьlmьş materjal orta və Şimali Avropada byzlak daşь ɋɵquntusu təşqil edib byralarь ɵrtdu. Bynynla barabar Avropanьn başka dag silsilələri də byz ɵrtuɋilə kaplanmьşdь; ɋuclu byzlaklar bynlarьn jamaclarьndan aşagь suruşərəq oraja jakьn duzlərdə hər tərəfə jajьlmьşdь. Bynlar dag dərələrini ɋenişlətdilər, dərinlətdilər və ɵz




Şəqil-8. Avropada qeçmiş byzlaklar sahəsi.

morenlərini çok kabaga apardьlar. Qeçmiş ɋuclu byzlaklarьn ɋɵrduqləri işin həmin by izləri uzrə ɋeoloqlar birinci dəfə olarak XIX-əsrin 20-ci illərində vaktilə Avropanьn byz ilə ɵrtulmuş oldygyny başa duşdulər: həmin byzlaklarьn əhəmijjətsiz kalьklarь hali-hazьrda Alp byzlaklarьndan ibarətdur. Alplarьn şimal jamacьnьn aşagь ətəqləri ilə başdan-başa bir byz çɵlu şəqlində imiş və by çɵl ilə Skandinavja tərəfdən hərəqət edən byz çɵlunun arasьnda byzdan azad dar bir zol var imiş. Pirenej, Karpat və Kafkas daglarьndan da jeqə byzlaklar enərmiş; Kafkas daglarьndaqь byzlaklardan birisinin jatagь, indiqi Darjal qeçidi olmyşdyr. Şimali Yraldan byzlar aşagь Ob çajьnьn dərəsinə enirmiş; laqin Sibirin kalan jerində başdan-başa byz ɵrtuɋu jok imiş; muxtəlif jerlərdə ancak ajrь-ajrь kar və byz ləqələri var imiş. Jeni Sibir adalarьnьn ierdən çьkarьlan byzy, həmin by ləqələrin birisinin kalьgьndan ibarətdur. Əhəmijjətsiz kalьnlьgь oldygyna ɋɵrə, by Sibir byzlarь Avropa byzlarь qibi elə dagьdьcь və aparьcь kuvvəjə maliq dejil imiş.

Kalьn byz katьnьn altьndan, ərimiş kar syjy akьrmьş. By sylar moren materjallarьndan xьrda hissələri jejir, byzyn hudy-

qah o jana, qah o bir jana hərəqət edir. Bə'zən barxanьn başьnь jel aparar, dibi isə jerində kalar; by halda qəhnə barxanьn uzərinə jeni barxan jerijir. Barxanlarьn belə bir jerdən diqər jerə hərəqət etmələri və bir-birinin ustə jьgьlmalarь nəticəsində (dijagonal uzrə) bir-birini çapraz qəsən karakteriq kym katlarь hasьl olyr (*şəqil* - 39). Kvars şəqilli dənələr ətrafьnda dəmir oksidi biriqməsi nəticəsində səhra kymlarьnьn çok vakt kьrmьzь



Şəqil-39. Barxan kymlarьnьn dijagonal kat-katlьgьnьn əmələ qəlməsi.

rənqli oldygyny da butun səjlədiqlərmizə ilavə etsəq, indi mevcyd olmajan səhralarьn reljefini jenidən kyrmak uçun bir sьra əlamətlər əldə etmiş olyryk.

**Turqustanьn qeçmişi.** Ittifakьmьzьn çok hissəsi dənizə akarь olmajan sahədən ibarətdur (*şəqil* - 37). Butun Volga hoyzy sylarьnьn Turqustan çeqəqində dyzly bəjuq bir qəldən ibarət olan Kaspi dənizinə təqulduqlərini jada salmak qafidur. By dəniz şəqsiz kyryjyr, bynynla ortaja bir məsələ də çьkьr - Olqəmizin bilavasitə Turqustan səhralarьna bitişiq olan hissələri də progressiv kyrymak təhluqəsi altьnda dejilmişdur? Çunqu Turqustana jakьnlaşdьkca, səhranьn tə'sirinin bəjuq oldygy bir çok misallardan qərunə bilər; bizim kara topraklь məhallərdən cənybi-şarkə hərəqət etdiqcə, xalis və munbit kara topragьn qet qedə zəifləşdiqini qərururuz: by toprak jarь səhra olan Astrxaxan həvalisində nihajət quli toprakla əvəz olana qibi şokolad, şabalьt, və sonra konyr rənqinə duşur Byrada olan bir azca prosent çurumuş maddələr toza okşar ana katьn ust hissəsini zəif tund rənqə salьr. Topragьn çuruntu katь kalьnlьgьnьn azalmasь, ot bitqisinin sьklьk və hundurluqunun azalmasь ilə koşa qedir. Ot bitqisinin şimala dogry azalmasьna səbəb meşələr isə, cənyb və cənybi-şərkə dogry qetdiqdə onyn azalmasь şubhəsiz qi, toprakda dyzlarьn mikdarьnьn artmasilə ələkədardyr. Şimalda meşələr sahəsində çokly jagan jagmьr, həll ola bilən mineral dyzlarьnь jyjyb jerin daha dərininə aparьr; byrada umymi kanyn olarak dajaz kyjylarьn sylarь jymyşakdyr. Bynlarьn syjy cənyba dogry qet-qedə agьrlaşьr. Toprak



dyzy katlarь qet-qedə juqsəlir və bir sьra toprak qəsiqləri uzərində joklamak olar qi, dyz tyrşysy ilə işlənmiş topraklar, qetqedə daha az dərinliqdə kajnamaga başlajьrlar. Bynynla barabar dyzlarьn tərqibi də dəijşilir: karbon tyrşysy dyzlarьna sonra ququrt tyrşysy dyzlarь, və daha sonra xlorly jə'ni daha jaxşь ərijən dyzlar katьşьr [1]). Turqustana tərəf qetdiqcə topragьn butun by dəjişmələri bizim dikkətimizi by səhra sahələrinə cəlb edir.

Bə'zən Turqustandan kyry və tozly jel əsməqə başlajьr; by jel Şyralar Ittifakьnьn Avropa hissəsinə artьk mikdarda narьn toz qətirir. Byna «kyry quləq» dejilir. Əqər by sьrada haman Avropa hissəsində kyraklьk və məhsyl kьtlьgь duşarsə, o zaman məsələ dahada qəsqinləşir va «əlqənin progressiv kyrymasь» məsələsi ortaja çьkar. Bə'zi faktlar Şyralar Ittifakьnьn Avropa hissəsinin ikliminin dogrydan da qet-qedə kyryınakda oldygy fiqrini məhqəmlətməqdədur. Çajlarьn, qəllərin və bataklarьn kyrymasь, nihajət kara topragьn məhsylynyn əqsilməsi byna subytdyr. By korkyly əlamətlərin hamьsь məsələjə elmi bir syrətdə jenidən və ciddi olarak bakьlmasьna məcbyr etmişdur. Laqin umymi nəticə mənfi olmyşdyr: əlqənin progressiv kyrymasь hələ qi isbat olynmamьşdyr. Daha dikkətli tətəbbə'lər iklimin perodiq dəjişmələrini və on illiq nəmişliqin on illiq kyraklьk ilə əvəz olyndygyny qəstərmişdur; byndan başka qeçmiş zamanlarda bə'zən çajlarьmьz çok korkyly bir syrətdə kyrydygy, hətta o zaman qəmilərin indiqindən balaca oldyklarьna bakmajarak bə'zən qəmi hərəqətinin dajanacak dərəcəjə çatdьgь da muəjjən edilmişdur. Hər nə kədər topraklarьn xarablaşdьgьna dajir bə'zi kət'i mə'lymatlar olyr isə də bynyn səbəbini təsərrufatьn kajdasьz aparьlmasьnda və topragь çok ibtidai usyllar ilə becərməqdə aktarmalьdyr. Bir zaman əlqənin kyrymasьnьn başlьca səbəbi, meşələrin kьrьlmagь sajьlьrdь. Laqin by fiqrdən əl çəqməq lazьm qəldi. Meşə (xusysilə cənybda) nəmişliqi jьgьrsa da, laqin by ancak topragьn ust katlarьna ajiddur. Meşə jer altь sylarьnь saklamajьr; işlədir; çunqu təbəxxur uçun bəjuq mikdarda syja ehtijacь oldygyndan, by sylarь meşə dərin, toprak altь katlardan çəqir. Meşə altьnda jer altь sylarьn səvijjəsi xusysən çok dərindədur. Əlqənin bir kədər kyrymasьnьn səbəblərini hər şejdən kabak dərələrin korkyly syrətdə bəjumələrində aktarmalьdyr. By dərələr həmin məhəlli drenazlaşdьrьr, jer altь və jagьş sylarьnь çajlara aparьr pardьklarь aqevşaq materjallar ilə çajlarьn jataklarьnь zibilləjir. Dərələrin artmasь isə artьk dərəcədə jenə də təsərrufatьn kajdasьz aparьlmasilə baglьdyr (məsələn, dərə jamaclarьnьn kajdasьz əqilməsi, jagьş selilə dərə divarlarьnьn jejilməsini qucləndirir). Əlqənin kyrymasьnda meşələrin kьrьlmagьnьn tə'siri var isə də, by dogrydan dogryja

1) Səhralarьn mərqəzi hissələrində asanlьkla ərijən şora qibi dyzlarьn çəqməsi də mumqundur.

olmjьb bilvasitə olyr. Jazda karьn şiddətli ərimısinin ənunu alan və qəqləri ilə topragь bərqidən meşələri kьrdьkda, bynynla biz dərələrin artmasьna jardьm ediriz. Topragьn nəmişliqinə meşələrin kьrьlmagьndan başka çəllərin əqilməsi də pis tə'sir edə bilər: qotan dəjınəmiş çəllər jaj və kьş nəmişliqini daha jaxşь saklajьr; laqin çəl flory tələf oldykda, topragьn təbəxxur etməq kablijəti artьr, və sylar çəldən daha tezliqlə akьb qedir. Çəllərin kyrymasьna xusysən malьn otarьlmasь səbəb olyr; çunqu mal topragь bərqidir.

Laqin, bynynla barabar meşənin arasь qəsilməz bir syrətdə hucymy əlqəmizin progressif kyrymadьgьnь isbat edən kət'i bir dəlildur. Daha dogrysy məsələ tərsinədur: əqər iklimimiz dəjişir isə by dəjişmə onyn nəmişliqinin artmasь cihətinədur [1]). Enli, qəq kara toprak zoly, by tip topragьn umymijjət uzrə çəl iklimınə maxsys və çokdan bəri mevcyd oldygyna ajdьn bir subytdyr. Dokyçajev kara topragьn jaşьnь ən azь 4000—7000 ilə tə'jin edir; by devr muddətində Rysjanьn cənyb hissəsinin iklimi umymijjətlə dəjişilməmişdur.

Hələ byndan bir az kabak aşagьdaqь fiqir həqum sururdu: Rysjanьn cənyb çəlləri olmasa da, hər halda Turqustan arasь qəsilməqsizin kyrymakdadyr. „By əlqə javaş-javaş əlqənin məhzyn bir mənzərəsidur. Turqustan javaş da olsa, laqin tədriclə kyryjyr; onyn təbəxxuru jagan jagmьrdan oldykca çok oldygyndan, sy ehtijatь əqsilir. Kyrydycy quləq, tozly atmosfer, juqsəq temperatyra isə qeçmişdən kalmьş o az mədəni jerləri də səhraja dəndərməqə çalьşьr" (Dingleştedt). Turqustanьn kyrymasь, butun Orta Asjanьn umymi progressiv kyrymasьnьn ancak xusysi bir hadisəsi qibi sajьlьrdь. By axьrьncь hadisəni bə'zi tətəbbə'çulər javaş-javaş əsrlər muddətincə Asjanьn juqsəlməsilə izah etməqi fiqirləşirdilər; haman juqsəlmə nəticəsində Asjada jer altь sylarьn səvijjəsi qet-qedə alçalьr, sy kyjylarь kyryjyr, vahələr tələf olyr və toprak bərq yçylyr. Orada-byrada səhra kymynyn altьndan çьkan çokly şəhər yçyklarь (Kozlovyn japdьgь Xora-Xoto qibi); Asja səhralarьnьn araınsьz bir syrətdə artmalarьnь açьkcasьna qəstərir [2]). Qəçərilərin mədəni vahələrə kçamalarь və kymlarьn Asjanьn dərinliqlərindən Avropaja olan umymi hərəqətləri Asjanьn progressiv kyrymasilə ələkədar dytylyrdy.

Son zamanlar Şyralar Ittifakьnьn səhralarьnьn məşhyr tətəbbə'çusu sajьlan Berg butun by məsləjə jenidən dikkətli bakmьş-

1) Biz hər jerdə hucym edən meşələr təsirilə kara topragьn degradasja ələmətlərini qururuz; laqin heç bir jerdə kymly topragьn kara topraga dənməqi qibi əqsinə bir prosesi qərməjiriq.

2) Səhraji-Qəbir kymlarь altьnda vaktilə artьk inqişaf etmiş həjatьn tapьlan tapkьlarь by əlqədə də ejni syrətdə belə proses oldygyndan bəhs etməqə jol verir. Çajlarьn çoklь kyrymyş jataklarь (vadilər) by jaxьn vaktlarda Səhraji-Qəbir çok çajlar vastəsilə sylandьgьnь qəstərir; hətta bə'zi tətəbbə'çulər Səhraji-Qəbirin məhsylsyz bir səhra olmasь, kədim Roma zamanьnda oldygy fiqrinə jol verməqə mejillənirdilər.



dyr. Asja hakkьnda olan tarixi xatirələri tədkik edərəq Berg byradaqь səhralarьn çok kədimdən by halda oldygy fiqrinə qəlmişdur. Jynan cografija mutəxəssisi Strabonyn verdiqi mə'lymata qərə miladdan 6 əsr əvvəl də Zərəfşan, indiqi qibi, kymlar içərisində itir, və Ummi-Dərjaja çatmajьrmьş. Marko Polo XII-əsrdə orta Iranь indiqi qibi bir səhra halьnda təsvir edir. Klavixo da (XV-əsr) Irandan Səmərkəndə olan joly və Myrgab uzrə olan sysyz səhranь haman by syrətlə təsvir edir. Byndan da daha kədim xatirələr vardyr; məsələn, sylama kanallarь sylarьndan istifadə etməq kajdasь hakkьnda olan kədim—Iran kanynlarьnьn tekstləri çok kədim zamanlarda by əlqə uçun sy ilə tə'min məsələsi çok çətin və qəsqin məsələlərdən biri oldygyny qəstərir, bir səz ilə Berg o nəticəjə qəlmiş qi, Orta Asjanьn cografi karakteri tarixdən sonraqь zaman içərisində dəjişilməmiş və byradaqь səhralar çokdan təşəqqul etmişdur. Əlbəttə iklimin qah çok kyraklьk, qah nəmişliq olmak uzrə bir kədər dejişmələr qeçirdiqini səjləməq olar; laqin belə qərunur qi, by dəjişmələr də periodiq karakterlidur. Şəhərlərin və sy qəmərlərinin yçyklarь, vahələrin tələf olmasь isə Orta Asjanьn fьrtьnalь tarixilə, orada olan daimi muharəbələr, kaçkьnlar və mədənijjət mərqəzlərinin yçyrylmasilə asanlьkla izah edilər. Bynyn hamьsьnda təbiət dejil, insanlarьn əzləri mukəssirdur [1]).

Byndan başka Berg Turqustanь təhkik edərəq o nəticəjə qəlmiş qi, byranьn hər jerində son zamanlarda nəmişliqin juqsəlməsi izləri ajdьn bir syrətdə qərunməqdə və bynynla barabar da səhralarьn inqişafь axьra çatmakdadyr. Hər jerdə dənəvər kym təbii bərqinməq stadijasьnь qeçirərəq, insan mane' olmajan hallarda bitqilə ərtulməqdədur. Aşьndьrma tə'siri və dənəvər kymlarьn təşəqqulu ildən-ilə javaşlajьr. Təpə kymlarda nəmişliq bəriqməqdə və qərunur qi, jer altь sylarьn səvijjəsi juqsəlməqdədur. Turqustanьn şimal hudydlarьnda çəl səhranьn ustə jerijir və butun by sahə bərq bitqilə ərtulməq stadijasьna daxil olyr. By prosesin kyrtarmasьna hələ çok vakt vardyr. Orada-byrada saqitləşmiş kym təpələrinin jenidən hərəqətə qəlməqlərinə bakmajarak xətasьz səjləməq olar qi, səhra Turqustan uçun qeolozi təqamulunun qeçirilmiş bir pilləsi sajьla bilər.

Bergin fiqrincə hali-hazьrda Turqustanda ləs daha əmələ qəlməjir. Ləs kabak devrlərdə tərəmiş qeolozi təşəqquldən ibarətdur. Ləs byrada topragь dejil, ana katь təşqil edir, və zəif də olsa,

1) Təxrib ədici muharəbələr və ja kabaklarda abadanlьk olan vahələrdə məsqən salmьş az mədəni əhalьnьn bakmamazlьgь, çok vakt byra çajlarьnьn bir çokynyn mukəddəratьna tə'sir edir: umymijjətlə səhra çajlarь sabit dejildur; toprak altь katlarda dərin qəqləri jokdyr və by çajlar kymlarьn və əz lьglarьnьn həqmu altьndadyrlar. Byna qərə də insan nəzəri daima bynyn ustundə olmalьdyr; əqs syrətdə bynlar təsadufi hallar tə'sirindən asanlьkla jatagьnь ufuki istikamətdə dəjişər və bynynla da butun bir əlqəni tamam sysyz kojar.

bitməqdə olan bitqi ərtuqu qəməqilə byndan xalis toprak, quli toprak əmələ qəlir.

Belə olan halda bəs ləsun və indi saqitləşməqdə olan Turqustan (dənəvər) kymlarьnьn şiddətli təşəqqulu nə zaman olmyşdyr? Bynlarьn hamьsь kabak qeolozi devirlərində əmələ qəlmişdur, və o devrin iklimi şəqsiz indiqindən çok kyry olmyşdyr. Deməli qi, Turqustanьn kabaklarda qeçirtdiqi devr nəmişliq devri dejildur, əqisinə kyry iklim devridur. Həmin o zaman Turqustan bir səhra şəqlini almьşdyr. Hali-hazьrda isə Turqustan muəjjən bir dərəcəjə kədər „jerdən çьkarьlan" səhradan ibarətdur. Həmin by mulahəzələr bizləri Turqustandan Avropaja kajьtmaga məcbyr edir.

**Jerdən çьkarьlan səhralar və byzlaklar devri.** Biz jykarьda meşənin çəl uzərinə olan jerişini kejd etdiq. Tarixdən kabakqь çəllər daha bəjuq imiş və daha şimala dogry hərəqət edirlərmiş. Deməq kabakqь devirdə Şyralar Ittifakьnьn iklimi daha kyry imiş. Həmin o zaman çəllərimizin və indiqi meşə—çəllərin altьndaqь ləs katь əmələ qəlmişdur. Tytkovsqi Volьn batak və meşələri arasьnda şəqsiz syrətdə tarixdən əvvəlqi zamana ajid olan səhralar izi tapmьşdyr: byrada səhra uçun karakter uç vəchli daşlar uzləri səhra janьgь ilə ərtulmuş daşlar və indi meşə basmьş kym təpələri tapьlmьşdyr. Byndan anlaşьlьr qi, Polesjanьn indiqi nəmişliq iklim şərtləri içərisində bynlar əmələ qələ bilməzdi. Bynlar tarixdən əvvəlqi devrə, qeolozіq qeçmişə ajiddur. Ləs zoly bizim Ittifakьmьzdan başlamьş, Karpat daglarьnьn janьndan qeçərəq Almanja, Belçika və Fransaja kədər qedir. Nering Garbi Avropanьn tarixdən əvvəlqi çəllərinə ajid olyb indi meşə ilə ərtulmuş olan by ana katda Orta Asjaja maxsys qəmiricilər və dьrnaklьlar kalьgь tapmьşdyr. Ibtidai insan Avropaja dagьlьb saqin oldykda, çəllərin həmin by zolyndan istifadə etmişdur (*şəqil*-40).

Jerdən çьkarьlan səhralar və tarixdən kabakqь ləs çəlləri, bəjuq donma səthini cənybdan və cənyb şərkdən ihatə etdiqlərinə qərə də Tytkovsqi Orta Avropanьn kabakdaqь kyry ikliminin by xatirələrinin donma ilə əlakədar oldyklarьnь səjlədiq. Tytkosqi „byzlaklar devrinin jerdən çьkarьlan səhralar" nəzərijjəsini ortaja çьkardь.

By halda o Alp əhalьsьna çokdan mə'lym olan hadisədən istifadə etmişdur. Daimi karlar ilə ərtulu yca daglardan çok vakt aşagь dərələrə d a g f ə n l ə r i adlь kyry və isti jellər əsir. Ilq bakьşda garibə qərunən by hadisə, daglar jamacilə enən hava sьkьlarak daha qəsifləşməsi və by sьrada ьsьnmasilə izah olynyr; bynynla barabar sьklaşmьş hava işba nyktəsindən yzaklaşarak kyry olyr. Tytkovsqi fen hadisələrini daha iri ələçidə qəturərəq byzlaklar devrinə qeçir. Bəjuq byz katь Avropa uzərində jeqə bir byz daglьgь şəqilində imiş; şimalda kabarьk və daha kalьn olan




Şəqil-40. Avropanьn tarixdən əvvəlqi çəlləri.

by daglьk kьraklara qetdiqcə naziqləşirmiş. By byz sahəsinin ortasьndaqь atmosfer təzjiki juqsəq imiş Hava by byz ərtuqunun uzərinə enir və byradan hər tərəfə jajьlьrmьş. Havanьn by aşagь enən sellərini Tytkovsqi „byzlak fenləri" adlandьrьr. Byzlaklar devri kyrtaranda və ərimiş karla syjyndan əmələ qəlmiş qəllərin kapladьgь dib morenini dalda kojarak, byzlar şimala dogry qerijə çəqiləndə, by tyndra çok əmur surə bilməmiş. Ustundən qeçən kyry və isti fenlər byny kyrytmyş; kalьn bitqi ərtusu ilə hələ bərqiməmiş byzlaklьgь aşьnmaga başlamьş, quləqlər moren materjlьndan narьn tozlarь çьkararak cənyba aparmьş; by usyl ilə byzlarьn kьraklarьnda kyry çəl əmələ qəlmiş və les katlarь toplanmьş; bə'zi jerlərdə isə daşlь həkiki səhra əmələ qəlmiş. Tytkovsqi dejir qi, Dərinliqlərində çəl izlərini qizlədən les də morenlər və byzlak daşlarь qibi byzlaklar balasьdyr. Ancak fərkləri ondadyr qi, moren və byzlak daşlarь byzlaklarьn quclərinin juqsəq oldygy zamanьn xatirələri, les isə byzlaklarьn can verdiqləri vaktьn xatirələridur. Byzlak ələndə əzundən sonra əlmuş moren sahələri kojyb qetmişdur. Ycy-bycagь olmajan byz səhralarьnьn jerini daşlь, qilli, kymsal səhralar dytmyşdyr. Nəticədə səhralar çəl bitqilərilə ərtulmuş, çəlləri isə meşələr kaplamьşdyr.

Byzlaklar devri sonynyn çəl və səhralarьnьn həmin by kyry devrində Turqustan səhralarь əmələ qəlmişdur.

Ləqin biz jykarьda qərduq qi, byzlaklardan sonraqь kyry devr, Baltiq dənizinin sahilləri tarixinə də tə'sir byrakmьşdyr. By tə'sir şimalda torf çəquntularında, ja inqi daha dogrysy torf çəquntularındaqi muvəkkəti ara qəsilmədə qərulməbdədur. Şyvalov torflygynyn „hudyd katьnь" xatirə qətirəq: by kyry iklimin bərpa olmasьnь sfagnymyn bəjuməsinin dajanmasьnь, kyry çam meşələrinin artmasьnь qəstərir. Belə „hudyd katlarьnьn" Baltiq dənizi sahillərində və hətta Rysja duzlərinin ortalarьndaqь oldykca kədim torflyklarьn hamьsьnda tapьlmasь, bizi by hadisəjə jalьnьz məhəlli əhəmijjət verməməqə məcbyr edir. Şəqsiz bynyn səbəbi fiziqi - cografi şərtlərin umymi dəjişmələrindədur.

„Hudyd katlarьnьn" əmələ qəldiqi zamanь lap duz tə'jin etməq olmazmь? By məsələni professor Jakovlev, Şyvalov, Glyxoozer və Laxtin qibi muxtəlif torflyklarьn kyrylyşlarьnь bir-birilə dytyşdyrarak həll etmişdur [1]).

Şyvalov torflygy bilavasitə Ansil dənizinin kymlarь uzundə oldygyna qərə, Glyxoozer torflygyndan daha kədimdur; Glyxoozer torflygynyn jatagьnь işə Litorin dənizinin qilləri çəquntusu təşqil edir. Hər iqi torflygyn ust mərtəbələri bir cur kyrylmyşdyr: hər iqisində də „hudyd katь" qəhnə və təzə sfagnym torfyndan ibarət olmak uzrə 2 kьsma bəlunmuş sfagnym torfy katь qərulur.

1) Professor S. A. Jakovlev, Наносы и рельеф г. Ленинграда и его окрестностей, 1926.



Laxtin torflygy Glyxoozer torflygy ilə bir jaşdadyr: by da həmçinin Litorin qili ustundədur. Laqin byny torf kalьnlьklarьnda, hudyd katьnьn jerini kədim Baltiq trangressija zamanьnьn naziq qilli kym katь dytmyşdyr. Torflyklarьn kyrylyşlarьndaqь by fərk hər iqi torflygyn dəniz səvijjəsindən muxtəlif hundurluqdə olmaklarь ilə izah edilə bilər. Byna qərə də kədim Baltiq dənizi hucymlarь zamanьnda Laxtin torflygyny basmьş bynyn sylarь əsqi sfagnym torfyny jyjyb aparmьş və əzu qeri çəqildiqdə, həmin məhəldə əz lьgьnь byrakmьşdyr. Glyxoozer torflygyny dəniz basmamьşdyr; laqin kədim Baltiq dənizinin qeri çəqildiqi kyry devrdə by torflyk kyrymyş və orada „hudyd katь" əmələ qəlmişdur. Belə qi, Baltiq torflyklarь tarixindəqi kyry epizod, Baltiq dənizinin axьrьncь qeri çəqilməsi zamanьna ajiddur.

Maraklь byrasьdyr qi, həmin by epizod başka qeolozi xatirələr ilə Leningrad ətrafьnda da qərulməqdədur. Biz Sestroretsk kym təpələrini nəzərdə dytyryk. Kym təpələri indi qeolozi təşəqqulatdan dejildur: bynlarь çokdan meşə basmьş və dənizdən agac bitqisi zoly ilə ajrьlmьşdyr. Bynlarьn təşqqulu uçun lazьm olan maerjal indiqi Baltiq dənizinin sahillərə tylladьgь kym olmamьşdyr: tədkikat qəstərdiqinə qərə bynlr kədim Baltiq dənizi kymlarьndan ibarətdur. Başka səz ilə by kym təpələri „jerdən çьkarьlan" kym təpələridur. Bynlar ilə bir jaşda olan hudyd katь qibi həmçinin bynlar da kyry iklim devrini, kədim Baltiq dənizinin qeri çəqilmə devrini qəstərir.

By təpələr Aral - Kaspi çəqəqinin kym çəquntularinə yjgyndyr; və bynlar Şyralar Ittifakьmьzьn bir birinə əqs olan bycaklarьnda fiziqi - cografi şərtlərin bir-birinə okşar oldygyny qəstərir. Həm Baltiq hevzəsi, və həm də Aral - Kaspi hevzəsi umymi bir həjat qeçirərəq qeolozi tarixinin birliqini əjani syrətdə qəstərmişlərdur. Laqin bynlarьn arasьda indi də bir o kədər fərk jokdyr. Tarixdən kabakqь çəllərin ləsu, Polesjanьn jerdən çьkarьlan səhralarь, bynlar hal-hazьrda ustdən maska qejdirmiş, laqin toprak və bitqi altьnda Turqustan barxanlarьnь və Baltiq sahillərinin kym təpə və torflyklarьnь bir-birilə birləşdirən tarixi halkalardyr.

## KARA DƏNIZ VƏ KASPI DƏNIZININ TARIXI.

Biz jykarьda Aral - Kaspi hevzəsi barəsində danьşdьk: Şimali Avropa bəjuq donma devri qeçirdiqi zaman, Kaspi bojy çəlləri dəniz ilə ərtulu imiş; indiqi Kaspi dənizi by dənizlərin kyrymakda olan kalьklarьndan ibarətdur (*şəqil*-28). Şəqsiz by hadisələrin hər iqisinin də bir səbəbi vardyr. Təsvir olynan zamanda iklim hər ərtьk dərəcədə nəmişliq imiş; laqin şimalda jagmьr halьnda jagdьkda, cənybda nəmişliq artmasь butun hevzədəqi sy səvijjəsinin

juqsəlməsinə səbəb olyrmyş. O vakt sybtropiq əlqələr byzlakdan artьk jagьşlьk (Pluvial) devri qeçirirdi, indijə qibi də by əlqələrdə vaktilə quclu sellər təsirinin izini qərməq olyr. O zaman indiqi səhralar hələ jok imiş [1]). Həttə Səhraji-Qəbirin iklimidə oldykca nəmişliq imiş; çaj jataklarьna çok okşamalarь ilə tətəbbu'çulərin dikkətini cəlb edən indiqi kyry dərələrin (vadilərin) bir çoky həmin o zaman əmələ qəlmişdur. Həmçinin Şimali Amerikada edilən tətəbbu'lərdə hal-hazьrda gərb ştatlar səhrasьnda bylynan dyzly qəlun indi jok olmyş bəjuq Bonnevil qəlunun əhəmijjətsiz bir kalьgьndan ibarət oldygyny qəstərdi. Bəjuq dyzly qəlu ihatə edən daglarьn jamaclarьnda Bonnevilin kabakqь sahillərinin pillələrini (terraslarьnь) qərməq olar; by pillələr indiqi qəl səvijjəsindən 330 *m* hundurdədur. Ancak byzlaklar devri kyrtarandan sonra indiqi səhralarьn bir muəjjən şaqlə duşməsi başlanmьşdyr.

Biz Ba'tiq dənizinin tarixilə aşna oldyk; by dəniz byzlaklar devri axьrьnda bir sьra qiçilmə və bəjumə devrləri qeçirdiqini də bılirıq. Ejni syrətlə Şyralar Ittifakьnьn cənybyndaqь Kara dəniz Azak və Kaspi dənizlərinin tarixini əjrənməq mumqun olmyşdyr. Şimali-Gərbdə biz dəniz çəquntulərini torf katlarьnьn əvəz etdiqini muşahədə edə bildiq. Byrada, cənybda isə ən ust Aral-Kaspi çoquntuləri altьn da butun bir serija (qilli kymly və qirəçli) muxtəlif katlar qərə biləriq. By katlar qeolozi zamanьnda dal-ba-dal biri birini əvəz etmiş muxtəlif dənizlərə ajiddur. By qeolozi xatirələri ilə əlqənin tarixini jenidən jazmak uçun bizə aşna olan metoda muracəət etməlijiq. By katlarьn hər birini ajrь-ajrь əjrənməlijiq; və by sьrada o katlarda qəmulmuş organizm kalьklarьna (hejvanlarьn kabьk, sumuq və dişlərinə) xusysi dikkət verməlijiq; by cur kalьklar tapьlan katlar hansь nəktələrdə oldygyny xəritədə nişanlamalьjьk. By nəktələri bir birinə bitişdirərəq jok olmyş butun bir hevzənin sahil cizqilərini çəqməq olar. Hər bir katьn ustundə by cur işləjərəq və ustdən aşagьja dogry təbəkələri bir-birindən ajьrarak jerin kabьgьnьn uzundən çəquntulər ərtuqunu dal-ba-dal qəturmuş qibi olyryk; by syrətlə dəniz və kyrynyn dytdyklarь jerin dərəcə-dərəcə dəjişmə mənzərəsi qəzumuzun əunundən qeçir.

Həmin by kajda ilə də Kara dəniz və Kaspi dənizi ustundə işləjəq.

Byzlaklardan kabakqь devrə qeolozidə u ç u n c u devr dejilir. Biz jerin çok dərin katlarьna əl aparmajacagьz; biz uçuncu devrin ortasьndan M i j o s e n devri adь'ilə tanьnmьş olan qeolozi momentindən başlajacagьz.

[1]) Məsələn, bizim Şyralar Ittifakьnda da Aral və Kaspi dənizlərindən şimala dogry kyndyr və torflyk maralь kalьgь tapьlmьşdyr; by isə byrada nəmişliq meşələrinin intişarьnь qəstərir.



Avropanьn Mijosen zamanьna ajid xəritəsindən (*şəqil*-41) o zamanqь Avropanьn şimali jarьsьnьn indiqi Avropanь oldykca xatьrlatdьgь qərunur; cənybi jarьsьnda isə bizə mə'lym olan Alp və Ag dəniz sahələri kontyry jeni-jeni tərəməqə başlajьr. Pirenej jarьm adasь deməq olar qi, muəjjən formaja duşmuşdur; Italjanьn fəkərat sutyny sajьlan Apenin daglarь da tərəməqə başlamьşdyr.




Şəqil-41. Mijosen devrində Avropa xəritəsi.

Balkan jarьm adasьnьn, Adalar dənizinin və Qiçiq Asjanьn jerində başdan-başa kyry Eqeida ycalьr. Alp, Karpat və Balkan daglarь karakteriq əjri-ujruluqləri i'ə qəzə çarpьr; laqin Alp və Eqeidanьn daglarьnьn şimalьna dogry en dajirələri istikaməti uzrə bir dəniz yzanьr qi, by Ron çajь sahəsində dar bir bogaz ilə Ag dənizə bitişir və Orta Asjanьn içinə, yzaklara kədər qedir.

Hal-hazьrda biz Kara dəniz və Azak dənizlərini Ag dənizin bir koly hesab ediriq. Ancak by dənizin Bosfor, Mərmərə dənizi, Dardanel bogazь və Adalar dənizi vasitəsilə birləşmələri çok jakьn zamanda olmyşdyr. Tarixi Kara dəniz Karpat daglarьnь dərt tərəfdən jyjan Macarьstanь basan və Alp daglarьnьn şimalьndan naziq kol halьnda hərlənərəq Ron bogazь ilə (o da ancak kьsa bir muddətə) Ag dənizin gərb hissəsilə birləşən Orta Avropa Mijosen dənizinin varisidur. Cənyb dənizlərimizin qeolozi mehvəri Kafkasja və Krьm dag silsilələridur; laqin by daglar ancak Karpat və Alp daglarьnьn yzantьlarь olyb onlar ilə bir jerdə bir „Alp" sistemi təşqil edirlər.

Mijosenin nihajəti jakьnьnda Ron bogazь və Alp ətəƣindəƣi dəniz koly bir-birilə birləşərəq bir sьra şirin syly ƣəl əmələ ƣəlir. Bynynla barabar Orta Avropa Mijosen dənizi, syjy bərq şirin olmasь lazьm ƣelən S a r m a t adlanan kapalь bir dəniz halьna çəvrilir. By dəniz Vjanadan və Macarьstandan başlamьş Karpatlarь dolanarak Novorossejadan qeçib Orta Asjaja jenələr. By dənizin cənyb hudydy isə başdan-başa kyrydyr (*şəqil* 42). Belə ƣerunur qi, iklimin kyraklьgь juqsəlmiş və Sarmat həvzi ƣet-ƣedə qiçilmişdur. M e o t i q adlanan bir zamanda by qiçilmə o dərəcədə artьr qi, by sahədə əmələ ƣəlmiş kyry-kyry qepruləri ilə Eƣeidadan bizim Şyralar Ittifakьna (fillər, ƣərƣədən, zərafə, antiloplar, və mejmynlar) qibi Afrika karakterli məməlilər qeçub ƣəlmişlər [1]). Bynynla da Mijosen devri kyrtarmьşdyr.



Şəqil-42. Sarmat dənizi.

P l i o s e n adlanan uçuncu dəvrin sonraqь (və axьrьncь) kьsmьnьn başlangьcьnda kabakqь qibi kyry kontinental iklim həqum surur. Sarmat dənizi səthinin jenidən qiçilməsindən P o n t adlanan ƣəl—dənizi [2]) əmələ ƣəlir (*şəqil*-43). Xəritədən də ƣerunur qi sahil xətlərinin bir azca jerindən ojnamasь by ƣəlun ajrь-ajrь indiqi dənizlərə belunməsinə səbəb ola bilər.

By, həkikətdə də belə oldy. Kaspi dənizi Kara dəniz və Azak dənizi hevzəsindan (Evksin hevzəsindən) ajrьldь. Ancak bə'zi zamanlar by iqi hevzə jenə də bir-birilə birləşirdi. Ƣərbdə Evksin hevzəsindən Rymanjaja indi Daqi hevzəsi ajrьldь. Ƣələcəqdə by uç hevzənin hər birinin inqişafь ajrь-ajrь jollar ilə ƣetmişdur. Laqin bynlarьn tarixi ƣedişlərinin umymi xassələri onlarьn hamьsьnьn progressiv şirinləşməsidur. Şirinləşmə hadisəsi isə onlarьn faynynyn azalmasь və şirin sy formalarьnьn terəməsilə koşa ƣetmişdur. By proses Sarmatdan başlamьş ƣerunməqdədur. Birinci dəfə olarak şirinləşmiş sy fayny Sarmat dənizinin ƣərb rajony olan Vjana hevzəsində ƣerunur. Haman proses byradan şərkə jajьlьr, Pont hevzəsində jerləşir; və nihajət byrada „Kaspi tipində“ fayn başlajьr.

1) Meotiq hevzinin təkribi hudydlarь 42-ci şəqildə nektəli çizƣilər ilə ƣestərilmişdur.

2) Pont dənizi ezundan sonra cur-bə-cur çequntulər bьrakmьşdyr: məsələn, kabьk parçalarьndan ibarət və cənybda inşaat işlərində işlədilən məsamatlь, sarь Odessa qirəc daşь suxyry by çequntulərdəndur. Qirəc daşь da Pont çequntulərindəndur.



Hamьsьndan sadəcə Rymanja hevzəsinin tarixi qeçmişdur. By, başkalarьna nisbətən çok tez şirinləşmiş və kyrymaga başlamьşdyr; Daqi dəniz katlarь ustunə şirin sy palydini adlь jymyşak bədənlilər jaşajan ƣəl çequntusu çeqdu (Levantin fayny).



Şəqil-43. Pont dənizi.

Evksin hevzəsinin tarixi isə daha murəqqəbdur. Qerç jarьm adasьnda Pont dənizi zamanьndan kalma sədəfli qirəç daşьnьn ustundən „Qerç mə'dən daşь katlarь“ deşənmiş oldygyny ƣerməq olar. By katlar Q i m m e r i əsrinin xatirələrindəndur. Qerçdən başka belə katlarь Kybanda, Syxym janьnda və Korejada ƣerməq olar (*Qimmeri dənizinin şərk sahili 44 ci şəqildə nektəli çizƣi ilə ƣestərilmişdur*). Ƣerunur qi, Qimmeri əsrinin iklimi isti imiş və by zaman muddətində Pont fayny inqişafьnьn ən juqsəq nektəsinə çatmьşdyr. Çajlar və bylaklar Qimmeri hevzəsi sylarьna çokly dəmir birləşmələri ƣətirirmiş; beləliqlə by hevzənin dibində „mə'dən daşь katlarь“ çequntusu təşəqqul etmişdur. Bynyn ustundən də daha qasьb faynly K y j a l n i t s təbəkəsi ƣedir. By, dənizin temperatyrasьnьn duşməsini ƣestərir; pliosen Qerç jarьm adasьndaqь bir byzynyn adьndan ƣeturulmuş „Çayda katlarь“ ilə kyrtarьr. By katlarda donma izi olan byzlak daşlarьnьn ƣerulməsi maraklьdyr. By byzlak daşlarь çequntu uzərinə ola bilsin qi uzən byzlardan duşmuşdur.

Pont dənizinin uçuncu şərk rajony daha murəqqəb istihaləjə ogramьşdyr; pliosenin lap əvvəlində, ƣələcəq Kaspi sahəsində kyry səhra iklimi başlamьşdyr; Pont katlarь uzrə kontinental və delta mənşə'li B a l a x a n ь adlь çequntu katlarь jatdь. Apşeron jarьm adasьnda neft həmin by katlardan çьkьr. Bynyn dalьnca Volga çajьnьn şərkində jer kabьgьnьn çeqməsi başlandь. By hadisə də jeni dəniz hevzəsinin təşəqqulunə səbəb oldy. A g ç a k ь l

dənizi namьnь alan by hevzə Volga və Yral yzyny yzak şimala (*şəqil*-44) Kazan gylerjasьna qibi qetmişdur və Ag çajьn sahillərində çəquntulər byrakmьşdyr. Umymijjətlə Agçakьlьn hər cur fayny Pont faynyna okşajьr.

Laqin muryri-zamanla jer kabьgьnьn yzynlyk dajirəsi uzərilə olan Agçakьl əjriliqi en dajirəsi uzərilə olan əjriliq ilə əvəz olyn-



Şəqil-44. Agçakьl dənizi.

dy. By hadisə Agçakьl dəniznin qet-qedə jol olmasьnь nəticələndirmiş və onyn jerində içərisində palydinlər jaşajan şirin syly qöllər kalmьşdyr. Bynyn dalьsьnca qələn qeolozi əsrdə Kaspi sahəsində Apşeron həvzəsi əmələ qəldi; by hevzə indi Kaspidən ancak bir azca bejuq jer dytyrmyş. O maraklьdyr qi, bynyn faynynda Çayda təbəkələrində təsaduf olynan formalar da bylynyr. By isə kədim Kaspi və Evksin hevzələrinin birləşmiş oldyklarьnь Apşeron təbəkəsilə Çayda katlarьnьn bir zaman əmələ qəldiqlərini qöstərir. Kaspi pliseoni Apşeron təbəkəsilə kyrtarьr.

Apşeron katlarьnь Baqь katlarь ortur; laqin by iqi katьn hudydlarьnьn çok qəsqin olmasь, təbəkələrin çəqmə prosesində



aralarь qəsilmələri oldygyny, Apşeron və Baqь devrləri arasьndan çok yzyn muddət qeçdiqini muəjjən syrətdə qöstərir. Dogrydan da Baqь katlarьnьn çəqməq zamanь, uçuncu devrdən çok kьraga çьkьr, və byzlaklar devrinə mənsyb olyr [1]). Laqin uçuncu devrdən byzlaklar devrinə qeçid tədric ilə olmyşdyr. Bejuq donma jer tarixinin muntəzəm qedişini qəflətən pozan bir fəlaqət, bir katastrof dejildur.

By, çokdan hazьrlanьrdь və bejuq donma bir-biri ilə baglь olan yzyn hadisələr zəncirinin ancak axьrьncь halkasь idi.

Uçuncu devrin axьrьna hələ çok kalmьş iqən qələcəqdə olacak donmadan xəbər verən hadisələr hiss olynyrdy. Uçuncu devrin iqinci jarьsьnda Avropa flory tropiq karakterini itirməqə başlajьr. Palmalar və pambyk agaclarь jok olyr, və heqmuranlьk palьta, agcakajьna, fьstьk agacьna, kovaga və fьndьk agacьna qeçir. Pont dənizinin çəquntularında by dənizin daşlь şimal sahillərini təşqil edən byzlak daşlь dag suxyrlarьna rast qəlinir. „By byzlak daşlarь qeniş Pont dənizi səthində ancak byzlar vasitəsilə dagьldьgьndan heç bir şəqq ola bilməz“ (N. Sokolov). Kьşda kajalarьn parçalarь sahil byzy ustə duşurdu, jazda isə byzlar by daşlarь cənyba aparьr. „Pont dənizinin uzu başdan-başa byz ilə ertulmuş və ja ancak kьraklarьmь donmyş, hər halda çok vakt bir neçə pyt agьrlьgь olan by daşlarь bir neçə juz verstlər aparmak uçun, byz, oldykca kalьn olmalьdyr“. Axьrda kьş ez heqmunu icrajə başlamьşdyr.

Pont zamanь bizim florda japragь formalar var idi; Agçakьl zamanь isə japragь təqulən formalar həmişə cavan bitqiləri tamam ortadan kaldьrmьşdyr. Qimmeri katlarь fayny iklimin istiliqini qöstərdiqi halda, bərq azalmьş Kyjalnits fayny temperatyranьn çok duşməsinin ajdьn bir subytydyr. Byzyn tə'sirinin şəqsiz izlərini Bessarabjanьn Levantin qöl çəquntularində, Çayda təbəkələrində və xusysən Apşeron katlarьnda qörməq olar. Beləliqlə jerdə tədric ilə jeni byzlaklar devri başlandь.

Apşeron katlarь heç də saqit və ufuki dejildur. By katlar kabakqь vəzijjətlərindən çьkarьlmьş və bərq əzilmişdur. Bynlarьn hamьsь Apşeron əsrinin jer altь qeolozi quclərinin intensiv bir syrətdə mejdana çьkmalarь zamanь oldygyny qöstərir. Dogrydan da əsas Kafkasja silsiləsinin juqsəlmə momenti Apşeron əsrinə mənsybdyr. Belə olan halda Apşeron katlarьnьn bə'zi xusysijjət-

1) Baqь katlarьnьn fayny, indiqi Kaspi faynyna çok jakьndyr.

ləri anlaşьlьr. Əvvələn daglarьn juqsəlməsi ilə akar sylarьn tə'siri artьr; sylar daglardan çokly iri daşlar jyjyb qətirir və dərələrə ja inqi dənizlər dibinə tyllajьr. Dogrydan da Apşeron təbəkəsindən çakьl daşь katlarь çokdyr. Iqincisi, daglarьn juqsəlməsi ilə daglarda kar ertuqunun artmasь bir-birilə əlakədardyr. Çokly gletçer byz daglarьn jamaclarьndan aşagь suruşməqə başlajьr: donma devri qirir. Professor Pavlovyn fiqrincə Apşeron devrinin axьrь birinci sajьlan qunts donma devridur.



Şəqil 45. Iqinci byzlaklar devrində Avropa xəritəsi.

Qunts donmasь başlьca olarak Alp sistemi daglarьnь dytmyşdyr. Byndan sonra qələn iqinci mindel və uçuncu ris donmalarь birincidən çok bejuq olmьşdyr. Iqinci donma (*şəqil*-45) Volga çajьnьn aşagьlarьna çatьb morenini Kamьşin rajonynda byrakmьşdyr. Uçuncu donma kabakqьndan bir kədər az jer dytmyş və Volga çajьnьn aşagьlarьna qəlib çatmamьşdyr (*şəqil*-46). By devrlərin hər iqisində də Şyralar Ittifakьnьn byzly sahələrindən ərimiş kar və byz sylarь akьb Kaspi çykyryna təqulurmuş. Kaspi dənizi tarixinin son hadisələri həmin by byzlagьn nəmişliq rezimi ilə əlakədardyr.

Almanjadan dytmyş Kaspi dənizinə qibi Avropanьn bir çok jerlərində byzlaklar çequntusunda—*Paludina diluviana* adlanan kastropod jymyşak bədənlilərin kabьklarьna təsaduf edilir. By



jymyşak bədənli iqinci (mindel-ris) byzlaklar arasь devrinin şirin syly hevzələrində jaşajьrmьş. By jymyşak bədənli 46 ci şəqildə qestərilən kədim Kaspi dənizinin çequntularьnda də rast qəlir. By dənizə X ə z ə r adь verilmişdur. Laqin Xəzər katlarьndakь *Paludina diluviananьn* kabьklarь uzərində dəniz dalgalarьnьn dejməsinin dagьdьcь tə'sirinin izləri vardyr. By kabьklar jyvarlak



Şəqil-46. Uçuncu byzlaklar devrində Avropanьn xəritəsi.

və uzləri surtulmuşdur; ajdьndyr qi, jymyşak bədənlilər xəzər əsrindən bir kədər kabak (şirin syly hevzlərdə) jaşamьşlar. Laqin Xəzər dənizi hucyma qeçdiqdə, by kabьklarь alt katlardan jyjyb aparmьş və sonra Xəzər hevzəsində çeqdurmuşdur. Xəzər çequntularьnda bynlar „iqinci jatak halьndadyrlar". Bynynla barabar Xəzər katlarьnьn altьndakь Baqь katlarьnda by forma hələ qi jokdyr. By hal Baqь katlarьnьn qeolozi jaşьnь tə'jin etməqə imqan verir. Baqь katlarь xəzər katlarьndan (jə'ni uçuncu ris donmasьndan) və hətta iqinci mindel-ris byzlaklar arasь devrindən daha kədim və Apşeron katlarьndan, jə'ni birinci qunts donmasьndan daha jeni olmalьdyr. Daha dogrysy Baqь katlarьnьn iqinci mindel donmasьna mənsyb olmasьdyr. Belə olan halda, Baqь katlarь, ərimiş sylarь ilə Baqь əsrində Kaspi dənizinin səvijjəsini kaldьran byzlarьn qətirmiş oldyklarь Kamьşьn morenləri ilə jaşьddyr.

Kədim Kaspi bir dəfə daha Yzak Şimalda Volganьn o tajьna Sьzranьn en dajirələrinə kədər qirməqə məcbyr oldy; Kaspinin

bəjuq by sonyncy hucymy valьn əsri adlanan əsrə mənsybdyr. Xvalьn katlarьndaqь fayn indiqi Kaspi faynyndan deməq olar qi, seçilməjir. Qθrunur qi, Xvalьn hucymy devri, axьrьncь —vurm—donmasьnьn byzlarьnьn ərimәq devrinə təsaduf edir.

Dal-ba-dal donma dalgalarь arasьnda Rysjanьn cənyb nihajətində muxtəlif byzlaklar arasь təşəqqulatь çequrdu. Məsələn, iqinci byzlaklar arasь devrində byzlarьn bərq əridiqi zamanda çol əjalətlərində kalьn kym və çьnkьl lьgь katlarь çeqmuşdur; çok vakt by katlarda qərqedən, jabanь equz, dəvə, at, maral, ajь qibi məməli hejvanlarьn zənqin kalьgь (tiraspol gravisi) bylynyrdy. Tiraspol çьnkьlьnьn çeqməq devri Lixvin qelu katlarьnьn təşəqqulu devrinə və Avropada Gejdelberg insanь jaşajan devrə təsaduf edir. Byndan başka, Lixvin qel merqelləri və les uzərinə uçuncu ris donmasьnьn (ust) moreni çeqduju zaman Glasje çelunun ancak kьraklarь olan Kara dəniz sahili les və lesə bənzər qilli kym katlarь ilə ertulurdu. Nihajət, derdduncu vurm donmasьnьn byzlarь əridiqdə, Xvalьn dənizi sahillərində gallej- xill tipli adam tərədi. By jakьnlarda bynyn kalьgь Yljanov gybernijasьnda Yndora qəndinin jakьnьnda tapьlmьşdyr [1]).

Kara dənizin tarixini kyrtarak. Kaspi dənizinin okjanysla rabitəsi qəsilmiş və hundur səvijjəsini jalьnьz bejuq donmanьn ərimiş kar və byz sylarь sajəsində muhafəzə edərəq progressiv bir syrətdə kyryjyrmyş; Kaspi bojy çeqəqi isə qundən-qunə kyry, akarь olmajan sahə şəqlinə duşurmuş, Kara dəniz hevzəsi isə Ag dəniz vasitəsilə okjanosla birləşmişdur. Iqinci donma zamanьnda (*şəqil*-45) Eqeida butunluqu ilə dyryr və Kara dənizi Ag dənizdən ajьrьrdь. Qələcəq Mərmərə dənizinin jerində ancak şirin syly qel var idi. Uçuncu donma devrində (*şəqil*-46) Eqeida xarab olmaga başladь. Kara dəniz çok qiçildi, Kaspi dənizindən tamam ajrьldь və səvijjəsi endiqindən çok aşagь endi. Eqeida xarab olmasa idi, bəlqə onyn da akibəti Kaspi qibi olardь. Eqeidada parçalanma və çeqmələr son donma zamanьnda əmələ qəlmişdur. By parçalanmalar Dardanelin və Bosforyn əmələ qəlməsinə səbəb oldy; bynlar Mərmərə qelunu dənizə çevirib Kara dəniz ilə Ag dənizin arasьnь açdь. Ag dənizin syjy şirinləşmiş Evksin çykyryna tequlub onyn səvijjəsini o kədər kaldьrdь qi, byraja tequlən

1) Pavlov. „Ископаемый человек эпохи мамонта в восточной России и ископаемые люди Зап. Европы“ 1925.



| | | Gərbi Avropa | Şyralar Ittifakьnьn orta hissəsi. | Daqi hevzəsi | Kara dəniz hevzəsi | Kaspi hevzəsi. |
|---|---|---|---|---|---|---|
| Byzlaklardan sonraqь devr. | | Ijoldi dənizi | | | | Xvalьn təbəkəsi |
| IV-byzlaklar devri (Vurm) | | | | | Ag dənizin kara dənizə tequlməsi | |
| 3-u byzlaklar arasь devri. | | | Troj qelu çequntusu | | | |
| III-Byzlaklar devri (Riss) | | | Mərqəzi gybernijalar ust moreni Lixvinin ust moreni. | lesun və lesəbənzər qellu kynyn təşəqqulu | | Xozar təbəkəsi |
| 2-ci byzlaklar arasь devri. | | Qejdelberg adamь. Paludina diluvianalь qillər. | Lixvin les və qel merqeli. | Tiraspol gravisi | Paludina diluvianalь kymlar. | |
| II-Byzlaklar devri (Mindel). | | | Mərqəzi gybernijalarьn alt moreni, Lixvinin alt moreni. | | | Kamьş moreni. Baqь təbəkəsi. |
| 1-ci Byzlaklar arasь devri | | | | | | |
| I Byzlaklar devri (Qjuns) | | | | | | |
| Apşeron təbəkəsi. | Pliosen | Lentin katlarь. | | Levantin katlarь | Çayda katlarь. | Apşeron katlarь. |
| Kyjalnist təbəkəsi. | | | | Daqi katlarь. | Kyjylanist katlarь | |
| Agçakьl təbəkəsi. | | | | | Qerç mə'dən daşь ustu katlar. | Agçakьl katlarь Balaxana katlarь. |
| Qimmeri təbəkəsi. | | | | | Qerç m'adən daşь katlarь. | |
| Pont təbəkəsi | | Pont katlarь. | | Pont katlarь | Odessa qirəc daşь. Qercin sədəfli qirəc daşь | Pont katlarь |
| Meotiq təbəkəsi. | Miosen | | | | Qerç qirəc daşь | |
| Sarmat təbəkəsi. | | | | | Sarmat qirəc daşlarь və qillər. | |

çajlarьn mənsibləri liman halьnь aldь. Əlbəttə by hadisə Evksinin deməq olar qi, şirin sy fayny uçun bir katastrof idi.

Şyralar Ittifakьnьn cənyb hissəsinin xəritəsi indiqi şəqlə duşdu və xalis dəniz fayny məsqən salmaga **jeni bir** sahə açьldь [1]).

---

1) Jykarьdaqь cədvəldə ust uçuncu bycaklar devrinin başlьca çəquntuləri mukajəsə edilmişdur. By cədvəl A. P. Pavlovyn (Неогеновые и послетретячные отложения Ю. и В. Европы, 1925) əsəri uzrə duzəzmişdur.

# II. Qeolozi kuvvələr.

## ENDOQEN VƏ EKSOQEN KUVVƏLƏR.

Byzlak devrinin xatirələrini Baltiq dənizinin və Turqustan səhralarьnьn tarixini tədkik etdiqdə, jerin tarixini əmələ qətirən „qeolozi kuvvələr" adlь məsələjə rast qəliriq. Jer qurəsinin dəjişilməsi ustundə aramsьz işləjən qəolozi kuvvələr iqi kategorjaja bəlunur. Eksoqen (jə'ni xarici) kuvvələr adьnь daşьjanlar jer qurəsinin uzundə tə'sir edən kuvvələrdur. Qunəşin istisi, hava, sy və byz qibi kuvvələr eksoqen kuvvələr sьrasьndandyr. Endoqen (jə'ni daxili) kuvvələr adьnь daşьjanlar jerin dərinindən onyn uzunə tə'sir edən kuvvələrdur. By, gaz əmələ qəlməsindən, vylkanizmdən (jer təprənməsindən) ibarətdur.

Eksoqen və endoqen kuvvələrinin istikamətləri muxtəlifdur; belə qi, eksoqen kuvvələr umymijjət uzrə dagьdьcь kuvvələrdən ibarət oldygyndan, hər bir hundurluqu duzəltməqə və hər bir çykyry dag suxyrlarьnьn yçmyş məhsyllarь ilə doldyrmaga çalьşьr. Əqər by kuvvələr tə'sirlərində tamamilə sərbəst olsa idilər, qectez jer tamamilə duz qurə şəqlinə duşərdi. Endoqen kuvvələr isə bynyn əqsinə olarak, jerin uzundə mumqun kədər nəhamvarlьk jaradьr. Beləliqlə iqi kategorija qeolozi kuvvələr arasьnda muəjjən mubarəzə qedir və hər bir məhəllin reljefi orada axьrьncь dəfə hansь kuvvənin ustun qəldiqini qəstərir.

Təbiətdəqi dagьdьcь proseslərin hamьsьnьn məcmyyna umymijjətən **aşьndьrma** dejilir. Aşьndьrma iqi cur olyr: fiziqi (mexaniqi) və qimjəvi aşьndьrma. Birinci cur aşьndьrmada ciddi iştiraq edən qunəş istisidur: temperatyranьn dəjişməsindən dag suxyrlarь qah şişərəq və qah sьkьlarak ajrь-ajrь parçalara bəlunur; by parçalar həmçinin qet-qedə jenə xьrdalanьr və nihajət kym dənələri və hətta toz halьna duşur[1]). Byndan sonra hava və akar sy qibi gejri eksoqen tə'sirlər işə qirişir və dagьlma məhsyllarьnь bir jerdən diqər jerə daşьmaga başlajьr. Quləqin qərduqu iş ilə dagьtma ja inqi defliasja ilə aşina olmyşyk. Iklimin artьk nəmişliqinə qərə bizim en dajirələrimizdə akar syjyn tə'siri xusysi syrətdə qəzə çarpьr. By tə'sirə erozija

---

1) Mineral qutlələrinin by cur mexaniqi xьrdalanmasьna sy dəxi tə'sir edir. Elə qi, sy, çatlaklar vasitəsilə suxyryn içərisinə qirir və temperatyr duşduqdə orada donarak həcmi bəjujur və by syrətlə çatlaklar daha da bəjujur.

ja inqi j y m a k dejiriq. Umymijjətən aşьndьrma məhsyllarьnь təmizlməqə və bynynla da jerin içini ojmaga səbəb olan proseslərin hamьsьna d e n y d a s j a prosesləri dejilir. Nihajət, hundur daglarda və kutub sahələrində byzyn dagьdьcь və aparьcь tə'sirini qərə biləriq.

Qimjəvi aşьndьrmada sydan başka atmosferin oksizeni və karbon gazь da iştiraq edir. Mineral hissələrinin qimjəvi prçalanmasь by nev aşьndьrma nəticəsidur.

Qɵstərilən qimjəvi və fiziqi amillərə, həmçinin jer kabьgьnьn ust mərtəbələrinin dagьlmasьna səbəb olan bitqilər, hejvanlar və bakterijalar da ilavə ediildiqdə, jerin uzunun ən artьk dagьlma sahəsi oldygyny kəbyl etməməq olmaz. By dagьlma nəticəsində t o p r a k əmələ qəlir. Toprak dediqdə iklim, hava sy bitqilər və hejvanlarьn məcmy tə'siri ilə dəjişdirilmiş jerin ust katь anlaşьlьr.

Laqin jerin ɵzundə aşьndьrьlan və qet-qedə topraga çevrilən mineral qutlələrini əmələ qətirən o jaradьcь proseslər harada başa qəlir? By syala cavab verməq uçun biz jer kabьgьnьn daha dərininə enməlijiz.

Jer kabьgьnь və həmçinin sajir səma cisimlərini, xusysən qunəşi tədkik etdiqdə, butun jer qurəsinin bir zaman ərinmiş bir halda oldygy kənaətinə qələriq. Ancak jer, sojyk boşlykda (fəzada) hərəqət edərəq javaş-javaş sojyjyrdy və nihajət, jerin uzu bərq kabьkla ɵrtuldu; bynyn ustundən h i d r o s f e r – sy ɵrtuqu və a t m o s f e r—gaz ɵrtuqu jerləşmişdur. Laqin indijə qibi jer ɵz nuvəsində qeçmiş ərimiş halьnьn izini saklajьr: bərq jer kabьgьnьn—l i t o s f e r i n altьnda jerin ərimiş katьnь—P i r o s f e r i— təşqil edən kajnar maje qutlə vardyr. Pirosfer maddələrinə m a g m a dejilir; laqin by maddələr vylkan çatlaklarь ilə jykarь kalkьb jerin uzərinə təqulduqdə isə ona l a v a adь verilir.

Mineral aləminin birinci əsasь olan həmin by magmadan butun minerallar və dag suxyrlarь hasьl olmyşdyr; laqin sonra bynlar yzyn və çok muxtəlif dəjişmələrə ograjarak toprak əmələ qətirməqə başlamьşdyr.

## JERIN KABЬGЬ.

Qul və kara toprak qibi bizim topraklarьmьz iklim, və organizim aləminin jardьmь ilə byzlak devrində byzlarьn tə'sirilə əsas kat suxyrlarьndan əmələ qəlmişdur. Belə qi, byzlak daşь qili byzlaklar vastəsilə Finland və Skandinavja daglarьndan qətirilmişdur; by məhsyl ən çok həmin ɵlqələrin kristallь dag suxyrlarьndan ibarətdur. Skandinavja Finland qutləsinin ən çoky granit qibi dag suxyryndan ibarətdur. Granit dənəvər kristallь kyrylyşly olyb, məchyl dərinliqlərə kədər işləmiş və jer kabьgьnda jəqə kajalar şəqlindədur. Tərqibi muxtəlif minerallardan ibarət oldygyna qɵrə



granit m u r ə q q ə b dag suxyrlaьь sьrasьna daxildur. Granitlərdə uç mineral kristalь seçə biləriz: çehrajь və ja kьrmьzь parçalar, o r t o k l a z („feldşpat" grypyndan birisi), ag və ja k a r a m i k a və ş ə f f a f k v a r s. Kvars qimja nɵkteji-nəzərindən çakmak daşьnьn, silisin $SiO_2$ saf oksididur. Mika və ortoklaz isə daha murəqqəb birləşmələrdən ibarətdur. Bynlarьn tərqibinə çakmak daşь, aluminiym oksidi və ja qilli toprak $Al_2O_3$ və kaliym oksidi $K_2O$ daxildur [1]).

Qɵstərilən maddələrin hamьsьnьn katьşьgьnь əridib by xəlitələri tez sojytsak, byndan şişə halьnda mutəcanis bir qutlə əmələ qələr. Kristallar çok javaş bɵjuduqlərinə qɵrə, tez sojydykda, ajrь-ajrь minerallarьn kristallarь çok da bɵjujə bilməz. Həmin by səbəbə qɵrə də vylknadan çьkьb təqulmuş və alçak təzjik altьnda jerin uzundə tez sojyjan lava, həmçinin şişə kyrylyşly olyr. Vylkan şişəsinə batmьş ajrь-ajrь xьrda kristalcьklarь ancak mikroskop altьnda qɵrməq mumqundur. Kьzgьn ərinmiş qutlə çok javaş və dərəcə dərəcə və artьk təzjik altьnda saklanьlьb sojydylarsa, o zaman ondan iri kristal fərdləri ajrьlьr. By bizə granitin dənəvər kyrylyşynyn tɵrənməsini ajdьnladьr. O, şəqsiz qi ərinmiş, kьzgьn qutlənin juqsəq təzjik altьnda javaş sojymasilə əmələ qəlmişdur; onyn hal-hazьrda Finlandda jerin uzundə olamasь isə ancak sonraqь denydasja nəticəsidur. V y l k a n və ja e f f y z i v (jə'ni juqsəlib jerin uzərinə təqulmuş) dag suxyrlarь grypyna mənsyb olan lavalarьn əqsinə olarak, granit, dərin (və ja i n t r y z i v) suxyrlar numynəsi sajьla bilər; laqin bynlarьn hər iqisi də „od" və ja e r y n t i v suxyrlar adь ilə birləşir. Bynlarьn hamьsь açьk və ja qizli kristal kyrylyşly olyb başdan-başa qutlə şəqlində jatmьşdyr; byna qɵrə də bynlar som-kristal suxyrlar adlanьr.

**Magma. Minerallarьn magmadan əmələ qəlməsi** Minerallarьn və dag suxyrlarьnьn qimjəvi təhlili, jerin kabьgьnьn əlimiz çatan jerlərində muxtəlif elementlərin nə dərəcədə intişar etmələri nakkьnda muəjjən bir fiqrə qəlməqə imqan verir. Litosferin qimjəvi tərqibi aşagьda qɵstərilən rəkəmlərdən ibarətdur:

| | | | |
|---|---|---|---|
| Oksizen (O) . . . | 50% | Titan (Ti) . . . . . | 0,3% |
| Şilisiym (Si) . . . | 26 | Karbon (C) . . . . | 0,2 |
| Aluminym (Al) . . . | 7,45 | Klor (Cl) . . . . . | 0,175 |
| Dəmir (Fe) . . . | 4,2 | Fosfor (P) . . . . . | 0,08 |
| Kalsiym (Ca) . . . | 3,25 | Manganez (Mn) . . . | 0,07 |
| Natriym (Na) . . . | 2,4 | Ququrt (S) . . . . . | 0,06 |
| Magneziym (Mg) . . | 2,35 | Bariym (Ba) . . . . | 0,03 |
| Kaliym (K) . . . . | 2,35 | Ftor (F) . . . . . . | 0,03 |
| Hidrozen (H) . . . | 0,9 | Azot (N) . . . . . . | 0,02. |

1) Kara mikanьn tərqibinə magniym oksidi də MgO daxildur.

# III. Jerin tarixi.

## ƢEOLOƵIQ TARIX.

**Dəniz dibi və onyn çɵquntuləri.** Kərələri təşqil edən əsas dag suxyrlarь arasь qəsilməqsizin yçmakda olarak, javaş-javaş qevşəq dilluvial və alluvial adlanan səthi jьgьnlar halьna duşur. Təpələrdən jagьş sellərinin aşьndьrьb suruqlədiƣi materjal dilluvial adlandьrьlьr (*şəqil*-82). Muryri-zaman ilə ɵlqə umymijjət



Şəqil-82. Təpə jamaclarьnda jagьşьn ƣɵrdyƣu iş.

uzrə duzluq oldykda, oradaqь akar sylarьn diri kuvvətləri az oldykda, dilluvijalьn çok kalьn katlarь təpələrin jamaclarьnь başdan-başa ɵrtub, haman məhəllə jymyşak, dalgalь bir şəqil verər (*şəqil*-83). Çajlar və arxlar qibi akar sylarьn çɵquntusunə alluvial dejilir. Bynlar hər daşgьndan sonra artarak çaj dərələrində duz hamvar, naziq katlь ɵrtulər şəqlini alьr. Ustləri açьlmьş əsas suxyrlar və bizim ƣɵzumuzun ɵnundə təşqil olynan dilluvial və alluvial, daha sonraqь ƣunəş tə'siri atmosfer jagmьrь, bitƣilər və hejvanlar tə'siri ilə dɵnub **toprak** halьna duşur.



Bir tərəfdən mineral qutlələri kərənin səthində arasь qəsilməqsizin bir jerdən diƣər jerə aparьlmaklarь ilə barabar, diƣər tərəfdən daima jaradьlьr, dagьdьlьrlar və jenidən ƣeoloƶi təşəqqulat əmələ ƣəlir; laqin ony deməq lazьmdyr qi, kərədə dagьdьcь proseslər, jaradьcь proseslərdən çokdyr; belə qi, bɵjujən dərələr çok bɵjuq dilluvial qutləsini ydyr, o tərəfə by tərəfə jerlərini dəjişən çajlar bir az ondan kabak çɵqdurduqləri jьgьnlarьnь yçyryr.



Şəqil-83. Təpə dɵşundə dilluvial ɵrtuq.

Byna ƣɵrədur qi, kərələrdə təşqil olynmyş ƣeoloƶi xatirələrinin çok azьnьn dagьdьlmamasь və ƣələcəq zamanlara kalmasь ehtimalь ola bilər. Ancak jer kabьgьnьn çɵquntu katlarьnьn bə'zi jerlərində çaj alluvial katlaьnь ja inqi vaktilə olmyş şirin syly ƣɵllər lajlarьnь tapmak ola bilər [1]). Byzlak morenləri də kərənin ƣeoloƶiq şahidlərindəndur. Səhralar ɵzlərindən sonra çok xatirələr byrakьrlar; jykarьda biz kym təpələri, uç vəchli daşlar, daşlarьn uzərindəqi səhra janьgь və dyz katlarь hakkьnda danьşmьşьz. Laqin axьr zamanlar mə'lym olmyş qi, Neystryjevin dediƣinə ƣɵrə, hətta „jer qurrəsinin dərisi" adlanan toprak kabьkcьgь qibi, ƣevrəq və daimi olmajan təşəqqul belə bə'zi mustəsna hallarda dagьlmakdan xьlas olarak kalьr. Toprak tipi iklimdən asьlь oldygyna ƣɵrə, muxtəlif məhəllərdə dagьlmakdan xьlaş olmyş kədim „ƣɵmulmuş" topraklar kalьgь uzrə haman ɵlqənin ƣeoloƶiq qeçmişdə iklimi nə təhər oldygyny sɵjləməq olar. Jerində biz dediq qi, şimalda murəqqəb dag suxyrlarь topraga çevrildiqdə tamam dagьlьr, ƣil ($Al_2O_3.2SiO_2.2H_2O$) təşəqqulu stadijasьnda dajanьr. Tropiq iklimdə dag suxyrlarь aluminiym oksidinin saf hidratьnь ixrac edənə qibi dagьlьr və beləliqlə boksit ($Al_2O_3.2H_2O$) toplanmasь əmələ ƣəlir. Bizim nəzərimizcə boksit nəmişliq tropiq iklimi əlamətidur. Belə olan halda məsələn, voroneƶ gybernijasьn da ƣɵmulmuş boksit katlarьnьn tapьlmasь, byzlak devrindən kabak by məhəldə hequm surən tropiq şərtlərini ajdьnlaşdьrьr.

Kərələr bir çok dagьdьcь proseslər sahəsi oldygy halda, okjanyslar bil'əqis aşьndьrmanьn ƣevşəq məhsyllarьnьn çɵqub biriqdiqləri bir sahədən ibarətdur.

Toprak əmələ ƣəlməsi proseslərində uzvi maddələrin nə kədər bɵjuq rol ojnadьgьnь biliriq. İklim ilə barabar bynlarda toprak əmələ ƣəlməsinin lazьmlь faktorlarьndan biri sajьlmalьdyr (diri ja ɵlu);

1) Ejni katьn dəniz, çaj ja inqi ƣɵl çɵquntusuna ajid oldygyny ƣeolog ancak by kalda tapьlan uzvi həjat kalьgь uzrə muəjjən edə bilər.

organizmlər olmadan toprak əmələ qəlməjir. Dag suxyrlarьnьn fiziqi aşьnma məhsyllarь hələ qi. topragь təşqil etməjir; ancak onyn mineral hissəsini toprak ballastьnь (kym və qili) və topragьn ərijən mineral dyzlarьnь təşqil edir. Toprak biosfer ilə sьkь-sьkьja karşьlьklь tə'sirə qirişən dag suxyrlarьndan ibarətdur. Jalьnьz iklim, hava və sy tərəfindən dejil, ejni zamanda başka organizmlər tərəfindən də işlənmiş mineral qutləsidur.

Bərq jerin uzundəqi toprak ertusunə yjgyn olarak, dəniz dibində çequntulər ertuqu vardyr. Ancak dənizin dərinliqlərində kərə, dag suxyrlarьnьn fiziqi aşьndьrьlmasьna səbəb olan eksoqen kuvvələr jokdyr: dəniz dibinin „toprak ballastьndan" ibarət olan dəniz çequntusunun mineral hissəsi byraja sahillərdən qətirilir, dənizə çajlar qətirib tequr. Kit'ələrin sahilləri dar və dajaz dəniz qəməri ilə ihatə olynmyşdyr; by dənizin dibi javaş-javaş 200*m*. kədər dərinləşir. By dajaz mejdança, kərənin yçgyn məhsyllarь ilə ertuludur: dənizin lap kьragьndaqь daşlar (xusysən ora kajalьk isə) dalga ilə hamvarlanmьş daşlardyr (çakьl). Dəniz içinə dogry qetdiqcə bynlarьn əvazinə kym və sonra da kym əvazinə qilli lil qedir. By çequntulərin hamьsь kərənin dəniz səvijjəsi altьna çeqmuş dilluvial (və ja alluvial) ertuqundən ibrətdur.

Dəniz syjynyn butun qutləsi organizmlər ilə dolydyr; okjanysdan protoplazmanьn umymi mikdarь çok bejuqdur. Dənizin həjatьnda uzvi maddələr çok muhum rol ojnajьrlar.

Dəniz syjy dyzlarьn muəjjən məhlylydyr. By dyzlar kərədə dag suxyrlarьnьn aşьndьrьlmasьndan əmələ qəlir və sonra onlarь çajlar dənizə aparьr. Laqin çaj və dəniz sylarьnьn dyzlarьnda bejuq fərk vardyr: dəniz dyzlarь arasьnda (mikdarca) klorly dyzlar birinci, ququrt iqinci və karbon uçuncu jer dytdygy halda, çaj sylarьnda karbonly dyzlar bil'əqis birinci jeri, klorly dyzlar axьrьncь jeri dytyr. Ajdьndyr qi, dəniz dyzlarь kərənin sadəcə jyjylyb dənizə aparьlmьş dyzlarьndan hasьl olmamьşdyr. Çaj dyzlarь ilə dəniz dyzlarь arasьnda dənizin organizm aləmi dyrmyşdyr. Dəniz organizmlərinin ən çok karbon birləşmələrinə və ən az klorly birləşmələrə ehtijaclarь vardyr. By syrətlə onlar dyzlar olan seçmə nisbətlərilə karbonatlarьn və kloridlərin nisbi mikdarlarьnь tamamən dəjişdirirlər. Deməq olar qi, dəniz syjy əvvəlcə protoplazmadan qeçmiş kərə syjydyr. Biz bildiqimiz hidrosferi indiqi hala salan dəniz organizmləridur.

Dəniz syjy kajnadьlьb byxar halьna çevrildiqdə, ondan muəjjən syrətdə dal-ba-dal ququrt-kalsiym, klorly natriym qibi muxtəlif dyzlar kristallarь tequlur. By proses dyzly qellərdə əmələ qəlir; by isti səhra iklimi elqələrdə dajaz dəniz qerfəzlərində də əmələ qələ bilər. Hal by qi adi şərtlərdə dəniz syjyndan karbon tyrşysy, fosfor tyrşysy dyzlarь və silis ajrьlьr. Çequntunun by



qedişi, dənizin organizm aləminin işi nəticəsidur. Kabьklar və dəniz hejvanlarьnьn isqeletləri dəniz syjynda ərimiş qimjəvi maddələrdən kyryldygyna qerə, bynlar, dəniz dyzlarь məhlyllarьndan muəjjən birləşmələrin ajrьlmasьndan və konsentrasjasьndan təşqil olynmyş və (hejvanlar eləndən sonra) toplanmьşdyr. Laqin ajrьlma çeqmənin sadəcə fiziqi-qimjəvi hadisəsi dejildur. By bioqimjəvi prosesdur. By, ortştejnin quli topraklardan çьkmasьna bənzəjir. Dəniz dibində (ortştejn katьndaqь qibi) uzvi maddələrin iştiraqilə muxtəlif qimjəvi birləşməli k o n k r e s j a l a r təşqil olynyr. Byndan başka dəniz dibinə duşmuş kabьgьn maddəsilə və ony buruјən dyz məhlyllarь arasьnda mubadələ prosesi əmələ qələ bilər. Kabьgьn maddəsinin jerini tamam başka bir qənar maddə dyta bilər və by syrətlə dəniz çequntulərində by qun daş halьnda tapьlan maddələr əmələ qələr.

Dəniz hejvanlarьnьn arasьnda çoklarь var qi, sydan çok bejuq mikdarda kalsiym alarak ez içlərində toplajьrlar. Laqin karbon-kalsiym dəniz syjynda nisbətən azdyr; orada ququrt-kalsiym daha çokdyr; şəqsiz qi, dəniz organizmləri sydan ququrt kalsiymy ydyb ony karbon kalsiyma çevirə bilirlər. By hejvanlar uzərində edilmiş təcribələr ilə də isbat olynmyşdyr. Sydan karbon-kalsiym nisbətən juqsəq temperatyrada çьkьr. Byna qerə də indi gajьb olmyş hər hansь bir dəniz hevzəsinin çequntuləri arasьnda qirəcin bollygy həmin devrin isti olmagьnь qestərir.

Baзka dəniz organizmləri isə ezlərində baзlьca olarak silis toplajьrlar. Silisiym ez-ezluqundə dəniz syjynda çok az mikdarda həll olmyşdyr. Ajdьndyr qi, silisli organizmlərin başka bir silis mənbələri vardyr. Jenə təcribə ilə isbat olynmyşdyr qi, onlar silisi qilli hissəciqlərdən də çьkarda bilərlər. Bynlarьn silis çьkarmak prosesləri oldykca alçak temperatyrada bejuq dərinliqlərdə və ja sojyk cərəjanlar sahələrində vake' olmakdadyr. Byna qerə də qirəçli və silisli organizmlər antagonistdurlər. Silisin və karbon-qirəcin dəniz dibindəqi çequntuləri arasьndaqь nisbət şimali sojyk topraklarьn quli şəqlə duşməsi ilə isti çel elqələrinin leslu topraklarьnda karbon qirəci əmələ qəlməsi prosesləri arasьndaqь nisbət qibidur.

Dəniz syjyndan kalsiymyn fosfor tyrşysy dyzlarьnьn çьkarьlmasь çok əhəmijjətlidur; by dyzlar kabьgьn ətrafьnda və içində f o s f o r i t biriqdirirlər. Belə biriqmələrdən bə'zən jeqə katlar təşqil olynyr; by katlar organizmlərin daş olmyş kalьklarь ilə doly olyr; bynlar qeçmiş devrlər hevzəsində adi fiziqi-cografi şərtlərin birdən pozylmasьnь qestərir. Uzvi maddələrin iştiraqilə dəniz dibində g l a v k o n i t adlь mineral toplanmasь ejni usyl ilə olyr. Byna ən çok sahil karakterli çequntuləri qestərən kymlarda və kym daşlarьnda təsaduf edilir.

Biz biliriz qi, qөllər çөk zaman bitqilər ilə өrtulur, və bynlar dөnub torflyk olyr. Bynlar altdan jykarьja qibi jarь pozylmyş bitqi kalьklarь ilə dolyr. Dəniz syjynyn butun qutləsi dibinə qibi artьk mikdarda oksiƶen ilə doly oldygyna qөrə, dəniz dibində karbonly maddələr lazьmi kadər toplana bilməjir. Laqin dəniz dibində də kərədən bir dənə də olsyn dag suxyry parçasь çata bilməjən qeniş mejdanlar vardyr; byrada ancak dəniz organizmləri fəalijjəti məhsyllarь toplanьr. Byrasь dərin dəniz sahəsidur. Kit'ələri ihatə edən dajaz sahil mejdançasь hədlərindən sonra, dənizin dibi tez alçalmaga başlajьr və enli səqilər ilə çok dərinliqlər tərəfə yçyrylyr. Belə dərin dənizin dibi dəniz hejvanlarьnьn kabьklarь ilə ortuludur; sahill dən nə kym, nə qil byraja qətirilməjir. Kabьklar dənizin dibinə arasь qəsilməjən jagьş qibi təqulur və həvzənin dərinliqindən, dəniz syjynda maddənin həll olmasь dərdcəsindən asьlь olarak çeşidlərə ajrьlьr və dənizin dibi muxtəlif nev'li organizm lil ilə өrtulur.



Şəqil-84. Globiqerin lili.

Qirəçli kabьklarь olan dəniz hejvanlarьndan g l o b i q e r i n adlь mikroskopiq rizopodlarь kejd etməlidur. Bynlarьn toplanmasьndan dəniz dibində globiqerin lili (*şəqil*-84) əmələ qəlir. Təbəşir həmin by globiqerindən tərqib olynmyşdyr. Deməli qi, by təbəşir qeçmiş devrlər okjanysynyn dibində qirəc lilindən əmələ qəlmişdur. Өz kabьklarьnь silisdən kyran organizmlər arasьnda ən muhum olan d i a t o m j o s y n l a r ь və r a d i o l j a r rizopodlardyr. Birincilərin toplanmasьndan diatom lili, iqincilərdən radioljar lili hasьl olyr (*şəqil*-85).



Şəqil-85. Radioljar lili.



Bitqi basan qөldə bitqi kalьklarь toplanmasьndan dib juqsələ bilər; dənizin dibi litosferin dəjişmə hərəqətində өz mutlək juqsəqliqini həkiki olarak dəjişə bilər.

Byndan başka litosferin by hərəqəti dənizi ufki istikamətdə də hərəqət etdirə bilər. Dəniz bir məhəlli basdьkda, əvvəlcə oranь өz kymy ilə өrtur. Onyn daha sonraqь hərəqətləri zamanьnda hər bir nөktədə sahildən olan məsafəsi artьr. By, çөquntulərin karakterinə tə'sir etməlidur. Sahil kymlarьnьn jerini qil və qilin jerini qirəçli lil alьr.

By syrətlə okjanys jer uzu ilə hərəqət etdiqdə, oranь өz çөquntuləri ilə өrtur; by çөquntulər vastəsi ilə okjanys өz transgresija və regressijalarьnьn, өz dərinləşməsinin və dajazlaşmasьnьn tarixini jazьr. Onyn suxyrlarьnьn katlarь onyn qeoloƶi ryznamasьnьn səhifələrini təşqil edir. Min illər qeçir və okjanys dibinin kymlarь k y m d a ş l a r ь n a qilləri q i l ş i s t l ə r i n ə daha dərin diblər qilləri (qirəç aşkarь ilə) m e r q e l ə, kirəcli lil—q i r ə ç d a ş ь n a, radioljar lili—s i l i s l i ş i s t l ə r ə dөnəcəqdur. Nihajət muryri-zamanilə hər hansь bir maddə ilə çementolanmьş sahil çakьlь, k o n g l o m e r a t adlь məşhyr xusysi dag suxyry hasьl edir.

**Qeoloƶiq xronoloƶi.** Jer katlarьnьn mutəvali sьralarь, vaktilə olmyş qeoloƶi hadisələrinin mutəvali sьralarьna yjgyndyr. Kabakda olan hadisələr daha dərin lajlarda jazьlmьşdyr; sonra onlarь daha jykarьda aktarmalьdyr. Əlbəttə paraktikada qeoloƶinin by başlьca kajdasьnь işlətməqlə barabar çok vakt lajlanmanьn normal tənasubunu pozan katlar dislokasjasьnь və denydasjanь da nazərə almalьdyr.

Jer kabьgьnьn ajrь-ajrь katlar gryplarьna ajrьlmasь barəsində indiqi qeoloƶi tərəfindən kəbyl olynmyş təksimat, XIX əsr içində tədric ilə muəjjən edilmişdur. Qeoloƶinin elmi əsasьnь kojanlardan Yerner (XVIII-əsrin axьrьnda və XIX əsrin əvvəllərində) butun jer kabьgьnь 4 iri mərtəbəjə və ja „formasjaja" bөlməqi kəbyl etmişdur:

4 — ən jeni qevşəq lьglar;

3 — içərisində çokly daş olmyş kalьklar və jerdən çьkarьlan mənfəətli mə'dənlər bylynan muxtəlif çөquntu suxyrlar;

2 — bə'zən kristallь bə'zən daşa dөnmuş kalьklь qilli və silisli şistlərdən konglomeratlardan və gejri suxyrdan ibarət qeçid formasjalar;

1 — əsas suxyrlar—granitlər, kristallь şitslər, qnejslər.

Verner jerin kabьgьnьn butun suxyrlarьnь hətta granitləri də dəniz çөquntusu məhsyllarь hesab etmişdur. Onyn fiqrincə vaktilə birinci okjanys butun jer qurəsini basmьşdь və onyn səvijjəsi indiqi daglarьn hamьsьndan hundur imiş. By səvijjə qet-qedə duşmuş, dəniz dibinə isə dag suxyrlarь halьnda muxəlif qimjəvi çөquntulər çөqmuşdur. Kərələr sy altьndan çьkdьkca, by qimjəvi çөquntulərə

kərənin mexaniqi yçmasь məhsyllarь da ilavə olmyşdyr. By sy-rətlə suxyrlarьn od'lan əmələ qəlmələrini nəzərə almamagьna və hətta granitlərin çoquntu suxyrlarь grypyna mənsyb olmaklarьnь səjləməqinə bakmajarak Verner jer kabьgьnьn çoquntu katь təşəq-qulunda dənizin nə kədər bəjuq əhəmijjəti oldygyny duz başa duşmuş və kijmət kojmyşdyr.

Daha sonralar Vernerin verdiqi sxema qet-qedə muraqqəb-ləşirdi; qeologlar kristallь suxyrlarь ajьrьb, dikkətlərini çoquntu katlarьn mufəssəl təksimatьnda dajandьrdьlar. Avropanьn mə'dən işlərinin çokdan bəri inqişaf etdiqi məhəllərində, insanlar jer „ka-bьgьnьn muntəzəm syrətdə bir-biri uzərinə jatmьş muxtəlif mərtə-bələri ilə tanьş olmyşdylar. Belə qi, Inqiltərədə daş qəmur katlarь altьnda byz „dag" qirəc daşь oldygyny bilirdilər; bynlarьn altьn-da və ustundə çok kalьn katlar ilə al kьrmьzь kym daşlarьna və by sonyncylarьn da arasьnda naziq daş dyzy və cibs katlarь ol-dygyny bilirdilər. Kym daşьnьn alt katь „kədim kьrmьzь kym daşь" və ustdəqi „jeni kьrmьzь kym daşь" adь ilə tanьnmьşdь; və ja məsələn, Almanjada mə'dən kazmaçьlarь çokdan „misli şist" verdijilən mis qulçəsi jatagьna (ocagьna) mənbys qulçəjə fiqir ver-mişdilər; onlar bilirdilər qi, misli şist kьmьzь kym daşь və kon-glomerat katь ustundədur; bynlarь „kьmьzь əlu jatak" adlandьr-mьşdьlar. Adəta misli şisti ərtən həmin boş suxyra „sexştejn" adь vermişlər. Nihajət, çok vakt qəzəl sarp kajalar təşqil edən ag təbə-şir katlarь hamьja mə'lym idi. Laqin Inqiltərə tətəbb'əçuləri tə-başir altьnda adəta jaşьl kym daşь katlarь, byndan aşagьda daşa dənmuş qurujə bənzər xьrda dənələrdən tərqib olynmyş açьk rəngli qirəc daşь katlarьnьn („oolit" formasjasь), və nihajət, Inqil-tərədə „lejas formasjasь" adlanan kara və ja konyr qillər oldygy-ny bilirdilər. Alimlərdə elə bir fiqir dogdy qi, by cur qeolozi təşəqqulatьn hamьsь jer tarixinin butun devrlərini karakterize edir; qeolozi devrlərinin xronoloziq cədvəli də haman bynlarьn adlarьn-dan təşqil olynmyşdyr.

Qeologlar muxtəlif lajlanmalarьn tez-tez dəjişmələrini təhlil etməq və bir-birindən yzak olan məhəllərin qeolozi kyrylyşlarьnь dytyşdyrmak uçun, katlarьn hamьsьnьn arasьndan daha muəjjən bir neçə katlarь ajьrmьşlar və həmin kata mənsyb olan suxyr-larьn butun jer qurəsinə jajьldьgьna inanmьşlar. Granit, daş qə-mur və təbaşir by cur əsas katlar olarak kəbyl edilmişdi. Beləliqlə jerin butun çoquntu katьnь bələn uç əsas xət alьnmьşdь; və qeolog bir jedə çalьşdьkda, orada hər şejdən kabak by katlarь tapmaga çalьşьrdь; çunqu by katlar ona başka lajlarьn və qeolozi təşəqqulatьnьn bir zamanda və ja muxtəlif zamanlarda əmələ qəldiqini tə'jin etməqə imqan verirdi.

Laqin butun jer kabьgьnьn muəjjən lajlar ajrь-ajrь mərtəbə-lərə və qeolozi vaktьnьn bir sьra ajrь-ajrь devrlərə bəlunməs-



fiqrinin duz oldygyna bakmajarak, by, kaçьnmak istənilən bəjuq səhvlərin tərənməsinə və jer tarixindəqi hadisələrin sьra ilə olma-sьnda karьşьklьgьn əmələ qəlməsinə səbəb oldy. Belə fərz edil-mişdur qi, məsələn, qəmur katlarьnьn hamьsь, butun dunjada, şəqsiz qi „daş qəmur" devrində və hər bir təbəşir „təbəşir" dev-rində əmələ qəlmişdur. Laqin sonralar mə'lym oldy qi, daş qə-mur jerdə çok muxtəlif devrlərdə əmələ qəlmişdur: hər bir zaman-da, munasib şərtlər oldykda, sy altьnda bəjuq mikdarda bitqi kalьklarь çurujən batlaklarda qəmur ocaklarь əmələ qələ bilərdi. Muxtəlif əlqələrin qəmurləri mutlək bir jaşda dejildur. Qəmuru ag təbəşirin altьnda oldygy qibi, ustundə də tapmak olar. Həmçinin təbəşir bir globiqerin çoquntusu oldygyndan, muxtəlif devrlədə əmələ qələ bilərdi. Diqər- tərəfdən ejni bir okjanys bir şərajitdə əzundən sonra kym, diqərində qil və uçuncusundə qirəç daşь byrakьr. Deməli qi, heç bir zaman belə duşunməq olmaz qi, bir devrin dənizləri, işgal etdiqi səthin hər jerində qirəç daşь və ancak qirəç daşь çəqdurə bilər; həkikətən belə qirəç daşь ilə butun devri karak-terize etməq olmaz. Bir vakt alimlər xusysi „təbəşir" devrinin muəjjən və mutlək xatirəsi olan aktardьklarь ag təbəşir əvəzində, başka əlqələrdə konglomerat kym daşlarь, şistlər və iləx... qibi gejri çoquntulər də ola bilər.

Suxyryn qimjəvi və mineral tərqibi vaktdan asьlь dejildur; onyn əmələ qəlməsi şərtlərindən asьlьdyr. Ancak bir nev' orga-nizm kalьklarь muxtəlif katlarьn bir zamanda əmələ qəlməsin tə'jin edir.

Dəniz syjynda cur-bə-cur dəniz hejvanlarь jaşajьr. Dogrydyr, bynlardan bə'ziləri bərq dalga dəjən daşlь dibdə məsqən salьr; diqərləri jaşamak uçun lilli dib seçirlər; bə'zlərinin jaşadьgь jer m əj-ən şərtlər ilə kət'i syrətlə məhdyddyr; diqərləri həmin hevzə dajirəsində qeniş syrətdə hər tərəfə jajьlmьşlar. Bizim uçun ən muhum olanlar, dənizin ən ustundə jaşajanlardyr; bynlar dalgalar və cərəjanlar ilə hər janə aparьlarak ələndən sonra dəniz dibinin hər jerində və onyn ən muxtəlif çoquntulərində qəmulə bilər. Dəniz kyrysa, sabik dəniz dibinin muxtəlif çoquntu suxyrlarьnda tapьlan by hejvanlarьn kalьklarь, bizim uçun butun by suxyrlarьn bir zamanьn çoquntusu, bynlarьn bir hevzəjə və bir qeolozi devrinə mənsyb oldygyny qəstərə bilər. Deməli qi, dəniz katlarьnьn bir za-manda və ja muxtəlif zamanlarda əmələ qəlməsini ən jaxşь və ən sadə bir syrətdə o katlarda qəmulmuş organizmlər ilə tə'jin etməq olar; bir zamanьn katlarьnda bir mikdar daşa dənmuş ejni orga-nizmlər bylynmalьdyr. Belə daş olmyş kalьklara „rəhbər formalar" dejiriz; çunqu, katlarьn jaşlarьnь tə'jin etdiqdə, bynlar dogrydan da rəhbərliq edə bilərlər.

By fiqri birinci olarak Inqiltərə qeology Viljam Smit mej-dana çьkartmьşdyr.

Muhəndis Viljam Simt kanal kazmasьnda işlədiqdə, Inƣiltərəni təşqil edən katlarьn dal-ba-dal olmasьna dikkətlə bakmьşdyr. O, by halda kejd etmişdur qi, bilavasitə bir-biri ustə dɵşənmiş iqi katьn daşa dɵnmuş kabьklarь bir-birinə çok okşajьr; bil'əqis şakyli istikamətdə bir-birindən yzakda olan katlarda qɵmulmuş organizmlərin bir-birinə az okşarlarь vardyr. Cur-bə-cur jerlər ƣəzərəq Smit inanmьş qi, ejni bir katь hər jerdə izləməq olar; laqin by izləməq onlarьn ƣɵrunuşləri və qimjəvi tərqibləri əsasь uzrə dejil, onlarda bylynan daşa dɵnmuş organizmlərin bir cur olmasь əsasь uzərinə olmalьdyr. By syrətlə ƣeolozi muxtəlif məhəllərin lajlarьnь bir-birilə duzƣun olarak mukajəsə və onlarьn bir və ja muxtəlif devrlərə ajid oldyklarьnь tə'jin etməƣə imqan tapmьşdyr.

Fransada Quvje və Bronjar adlь alimlər də by əsas uzərinə işləjirdilər. Onlar da jerin cur-bə-cur lajlarьna muxtəlif „jerdən çьkmalar“ oldygyny kejd etmişdilər. Laqin onlar byndan başka bir şejə də fiqir vermişlər qi, daha jykarьdaqь lajlarda toplanan hejvanlarьn kalьklarь, indi jer uzundə jaşajan organizmlərə daha çok okşajьr və aşagь ƣetdiqcə, jerin indiqi jaşajanlarь ilə laja ƣɵmulmuş kabakqь organizm aləminin okşarь daha azdyr.

Təqamul idejasь hər tərəfə jajьlmьşdь; laqin by ideja indiqi formaja birdən-birə duşmədi.

Quvje və Bronjar zoolog oldyklarьna ƣɵrə, onlar indiqi həjatdan çok fərkli olan kabakqь organizm həjatьnьn kalьklarьnьn daşa dɵnmuşləri ilə maraklanьrdьlar[1]). Umymijjətlə adamьn aglь hər bir şejdə ajьrd edici nişanələri okşadьcь nişanələrdən daha tez hiss edir. Quvje də byndan xьlas ola bilmədi; Paris katlarьndan bizim uçun təəcublu və adətdən xaric ƣɵrunən məhv olmyş hejvanlarьn isqeletlərini çьkardan Quvje daha artьk by hejvanlarьn xusysijjətləri ilə maraklanmьş və məhv olmyş hejvanat aləminin indiqi hejvanat aləmindən əsaslь syrətdə fərkli oldygyna kənaət ƣətirmişdur. Onyn uçun ajdьn idi qi, jerin lajlarьnda bir birinin dalьsьnca ƣəlmiş bir neçə hejvanlar aləmi kalьklarь ƣɵmulmuşdur və onyn uzərində by kədər muxtəlif aləmlər arasьnda heç bir qeçid jok imiş. Belə olan halda organizm aləmi tarixindəqi by qəsƣin fasilələr ancak bir formanьn məhv olmasь və başka formalarьn jaranmasьndan başka bir syrətlə izah edilməzdi.

Həmin byrada ƣeologlar vylkan fəlaqətlərini xatirə ƣətirdilər; onlarьn fiqrincə by fəlaqətlər qeçmişdə jer qurrəsini dəfələr ilə titrətmiş və organizm aləminin təzələnməsinə səbəb olmyşdur. Laqin Quvje ehtijatlь bir alim oldygyndan by fəlaqətlərin butun dunjanь kaplamьş və saqinlərini tamam məhv etmiş olmasьna jol verə bilməjirdi. Onyn fiqrincə by katastroflarьn ancak məhəlli əhəmijjəti var imiş. Bynlar bir kit'ənin saqinlərini qulə dɵndərə bilərdi; laqin jerin gejri bycaklarьnda isə həjat ɵz joly ilə ƣedərəq, arasь qəsilməqsizin inqişaf edirdi. Katastroflar heç bir vakt həjatьn qəqunu qəsməjirdi; laqin ancak hejvanlar daima bir jerdən diƣər bir jerə ƣeçməƣə məcbyr olyrdylar. Devrdən devrə olan katastroflar bynlarь kovyrdy, bynlar bə'zi sahələri byrakьb gejrilərinə ƣeçurdulər; əlbəttə by „ƣeçlər“ muəjjən bir yzaklьkda bizə ƣəflətən əmələ ƣəlmiş bir dəjişmə tə'sirini byraka bilər.

Quvjedən daha az ehtijatlь olan alimlər daha kabaga ƣetmişlər. Bynlar vylkan katastroflarьna artьk dərəcədə umymi bir karakter vermişlər; onlarьn fiqrincə vylkanlarьn dagьdьcь tə'siri butun dunjaja jajьlmьşdyr. Bir kit'ənin diri saqinlərinin başka kit'ənin diri saqinləri ilə dəjişməsi fiqri iqinci plana ƣeçmişdur. Bynyn la barabar tədriclə dəjişən hejvanlar arasьndaqь hər bir rabitə qəsilmişdi; ƣeçmiş ƣeolozi devrlərdə sələfləri olmajan çokly muxtəlif cinsli hejvanlarьn jer qurrəsinin hər tərəfində bir zamanda və „ƣəflətən“ tərəmələrini izah etməq uçun xusysi „jaradьcь aktlara“ ƣizli „jaradьcь bir kuvvənin“ jardьmьna muracəət etməƣə məcbyr oldylar. Belə qi, d'Orbin, butun ƣɵquntu katlarьnьn daş olmyş kalьklarьna əsaslanarak isbat etmiş qi, jer 27 cihan katastrofy qeçirmişdur və muxtəlif ƣeolozi devrlərinin faynlarь bir-biri ilə heç bir qeçid formalar ilə baglь dejildur.

Laqin bir vakt ƣəldi qi, tədkikatçьlarьn daha həssas ƣɵzləri məhv olmyş organizmlərdə indiqi organizmlərə okşar xassələr ƣɵrdu. Inƣiltərə alimi Lijajel katastrof nəzərijjəsinə galib ƣələrəq, uzvi təqamul nəzərijjəsinə məhqəm ɵzul kyrdy; daş olmyş kalьklarь tədkik edərəq o fiqrə ƣəldi qi, jeni hejvanlar muxtəlif katlarda mejdana birdən-birə dejil, ancak tədric ilə qɵhnələri javaş-javaş əvəz etməq syrətilə çьkьrlar. Kat nə kədər jykarьda isə ondaqь hejvanlarьn o kədər çok fajizi hal-hazьrda jerin uzərində jaşajьrlar. Jerin saqinlərinin tarixindəqi katastrof fasilələri hakkьndaqь kabakqь fiqri ancak bir-birindən çok aralь katlarь mukajəsə etdiqdə anlamak və təsdik etməq ola bilər. Laqin belə olan halda biz həmişə okşar lajlar arasьnda aralьk katь olan elə jerlər tapa biləriz qi, by aralьk katьn daş olmyş katlarь aşagьqь və jykarь katьn formalarь arasьnda tamam və ƣɵzə çarpmajan bir qeçiddən ibarət ola bilər.

Lijajel elmdə birinci olarak butun ƣucu ilə ƣeolozi tarixinin çok yzyn ɵlmaklьgь idejasьnь ortaja atdь. Ƣeolozi hadisələrinin ƣedişini biz ɵjrənmiş oldygymyz juz illər, min illərdən ibarət vahidlər ilə ɵlçməq istədiqdə, elə „miljon“ və „miljard“ illər alьrьz

[1]) Quvje tərəfindən jaradьlmьş munkəriz organizmləri hakkьndaqь elm, paleontolozi namьnь almьşdyr.

qi, by rəkəmlər bizim duşuncəmizdə jerləşməjir. Byna qərədə qeolozi elmi vaktь mutlək dejil, nisbi əlçur.

Jerin butun tarixi eralar və daha qiçiq olan devrlərə və ja epoxalara bəlunur. Devr dediqdə, aləm zamanьnь: 1) jer uzunun şəqlinin halь ilə, 2) fiziqi-cografi şərtlərin muəjjən məcmyy ilə, 3) muəjjən organizm aləmilə karakterize olynan bir fasiləsi anlaşьlьr. Əlbəttə tamamilə ajdьndyr qi, jerin uzu onyn iklimi və organizm aləmi hamьsь bir-biri ilə sьkь-sьkьna baglь və məşrytdyr. Byna qərə də qeologlar jer uzunun şəqli və ja iklimi barəsində bir fiqir əldə etməq uçun onyn organizm aləmini tədkik etməqə məcbyr olyrlar; və belə etməqdə onlar heç də janьlmazlar; çunqu organizm aləmi ən həssas bir barometro qibi xarici muhitin butun dəjişiqliqlərini in'iqas etdirir. Əlində daş olmyş bir kalьgь dytan qeolog uçun by kalьk, jalьnьz muryri zaman ilə surtulmuş organizm həjatьnьn kalьgь dejil, hər hansь bir devrdə dəniz dibində əmələ qəlmiş muəjjən mineral təşəqqulatьndan və haman dənizin muəjjən bir hissəsindən ibarətdur. By kalьga qərə qeolog haman dənizin dibində həqum surən fiziqi və qimjəvi şərtlər hakkьnda bir fiqir əldə edə bilər.

Laqin diqər tərəfdən dəniz kərə ilə ejni bir əmur surur: dəniz çəquntuləri kərə topraklarьnьn analogydyr. O halda byradan konşy kit'ədə olan fiziqi-cografi şərtlər hakkьnda da muəjjən bir nəticə çьkarmak mumqundur. Dəniz-jerin tarix jazanьdyr. Laqin dəniz, jerdə tərəjən hadisələrin ancak passiv şahidi dejildur; dəniz, jer ilə umymi və bir əmur surur; onynla min bag ilə baglanmьşdyr.

Muəjjən bir devr içərisində jerə çəqən butun katlarьn serijasь qeolozi sistemi təşqil edir. Umymijjətlə katlarьn sistemi kьsьmlara (ust-orta-alt) bəlunur qi, bynlara çok vakt xusysi adlar verilir. Kьsьmlar da təbəkələrə bəlunur və nihajət çok vakt kət'i olarak muəjjən bir „rəhbər forma" ilə karakterize olynan ən qiçiq təksimata da mintəkə (zona) dejilir.

Konibir və Fillips 1822-cl ildə „daş qəmur sistemini" tə'jin etmişdur. Inqiltərədə aşagьdaqь katlarьn haman by sistemə ajid oldygyny hesab etmişlərdur: a) qilli şistlərdən və kym daşlarьndan tərqib olmyş qəmurlu katlar; bynlarьn arasьnda daş qəmur lajlarь jerləşmişdur və b) „dag qirəc daşь" adlanan kat. Gərbi-Avropada dag qirəç daşь qəmur sisteminin alt kьsmьnь və qəmur katlarь isə ust kьsmьnь təşqil edirlər. Bizim Şyralar Ittifakьnda həmçinin kalьn dag qirəc daşь katь vardyr; laqin qəmur katlarь onyn ustundə olmajьb, altьna dəşənmişdur.

Həmin 1822-ci ildə „təbəşir" sistemi tə'jin olynmyşdyr. Sistemin ancak ust kьsmьnda qeniş inqişaf etmiş jazan ag təbəşirdən başka by sistemə bir çok və muxtəlif dag suxyrlarь daxildur; çokdan qeologlar bynlara cur-bə-cur məhəlli adlar kojyb ajьrmьşlardyr.



Inqiltərə alimi Bekland jerin ən ust katlarьnь əjrəndiqdə, onlarь: ust—alluvial və alt—dilluvial olmak uzrə 2 kьsma bəlmuşdur. Dilluvial dediqdə, Bekland mukəddəs qitabьn qəstərdiqi „tyfan" zamanьna ajid kədim lьglarь qəstərməq istəjir. („Delluvi" qəlməsi „tyfan" mə'nasьnь ifadə edir). Sonralar dilluvial çəquntuləri byzlak çəquntuləri qibi kəbyl edilmişdur; bir səz ilə, dilluvial səzu byzlak devrini kejd etməqə başlamьşdyr. Dag mə'dən işçiləri arasьnda „ala bəzəq kym daşь" və „kabьklь qirəc daşь" adь ilə bir-birindən ajrьlan formasjalar sijahьsь ustunə artьrarak Bekland 1823-cu ildə butun formasjalarь by usyl ilə gryplara ajьrdь:

11—Alluvial
10—Dilluvial
9—Təbəşir ustu formasjasь
8—Təbəşir formasjasь
7—Jaşьl kym daşь formasjasь
6—Volit formasjasь
5—Lejjas
4—Kabьklь qirəc daşь
3—Ala bəzəq kym daşь
2—Daş qəmur formasjasь
1—Əsas kristallь suxyrlar.

1829-cy ildə Bronjar oolit formasjasь ilə lejjasь „zyra" sistemi adь altьnda birləşdirdi; 1839-cy ildə isə by zyra suxyrlarьnьn çok təsaduf edən rənqlərini nəzərə alarak zyra sistemini 3 kьsma bəlməqi təqlif etdi: 3) ust və ja ag zyra, 2) orta və ja konyr və 1) alt və ja kara. Laqin by „rənq" adlarь elmdə jer dyta bilmədi.

Inqilis Myrçison və Secvik daş qəmur formasь ilə əsas kristallь suxyrlar arasьndaqь katlarь ətraflь syrətdə tədkikə başladьlar. 1833-cu ildə Myrçison „silyr" sistemini və 1836-cь ildə Secvik, silyr sisteminin altьnda və bilavasitə granitlər və gnejslər ustundə olan „qembri" sistemini ajьrdьlar[1]. Həmin Myrçison və Secvik 1839-cy ildə silyr və daş qəmur sistemləri arasьnda „devon" adlь sistem ajьrmьşlar. Çokdan mə'lym olan „kədim kьrmьzь kym daşь", da by sistemə daxil edilmişdi. „Təzə kьrmьzь kym daşь" isə onyn gejri formasjalar arasьnda dytdygy və-

1) Sonralar silyr alt və ust şə'bələrə təksim olynmyşdyr; bə'zi qeologlar by şə'bələri mustəkil sistem dejərəq kəbyl etmişlərdur.

zijjət bir kədər qec muəjjən edilmişdur. Myrçisonyn Rysjada japdьgь sijahət, ona Yral bojynda inqişaf etmiş xusysi lajlanmalarьn butun serjalarь ilə aşna olmaga imqan vermişdur; 1841-ci ildə Myrçison bynlarь xusysi „perm“ sisteminə ajьrdь. By sistem өz vəzijjətinə qөrə „təzə kьrmьzь kym daşьna“ və jerdən çьkarьlan kalьklara qөrə Almanjada aralarьnda misli şist jatmьş sexştejn və kьrmьzь өlu jatakdan ibarət olan iqi formasja yjgyndyr. By syrətlə perm sistemi gərbdə də tə'jin olynmyşdyr. Laqin belə mə'lym oldy qi, „təzə kьrmьzь kym daşь“ katlarьnьn bir hissəsinin jaşь perm sistemi içindən daha çokdyr; byna qөrə də by, kəbaklarda qeologlara ala bəzəq kym daşь və kabьklь qirəc daşь adь ilə mə'lym olan katlara ilavə edilməlidur. „Qejper“ məhəlli adьnь daşьjan daha ust formasja ilə barabar by formasjalarьn hamьsь bir sistemə toplanmьşdyr və bynlar uçun 1834-cu ildə Alberti tərəfindən „trias“ adь təqlif olynmyşdyr.

Myrçison və Secvik Vernerin qeçid formasjasьnь ajrь-ajrь sistemlərə bөlməqə məşgyl iqən, bir sьra qeologlar Beklandьn „təbaşir ustu formasjasь“ adь ilə mə'lym olan təbaşir formasjasь ilə dilluvial arasьnda jerl əşmiş katlarь ətraflь bir syrətdə tədkik edirdilər. Katlarьn by serijasьna „uçuncu“ sistem adь verilmişdur; byny birinci dəfə olarak italjalь Ardyino (hələ 1760-cь illərdə) iş ətmişdur; Ardyino Italjanьn Toskan sahəsi lajlamalarьnь tədkik edərəq, byrada da həmçinin Vernerin Almanjada tə'jin etdiqi jer kabьgьnьn 4 bөjuq kьsma bөlunməsini kejd etdi. Sonralar Lijajel və başkalarь uçuncu sistemi aşagьdaqь kьsьmlara bөlmuşlərdur: 5) pliosen, 4) miosen, 3) oligosen, 2) eosen və 1) paleosen.

Jykarьda səjlədiqlərimizə Filips tərəfindən 1841-ci ildə butun qeolozi zamanьnьn paleoziq, mezozoiq və qenozoiq adlь 3 bөjuq eraja bөlunduqunu və 1872-ci ildə Dana tərəfindən organizmsiz ancak kristallь suxyrlarь kalan kədim qeolozi zamanlar uçun təqlif etdiqi arxeiq erasь ilavə edilsə, aşagьdaqь cədvəli əldə edəriz qi, hal-hazьrda qeolozi zaman by cədvəl uzrə hesablanьr (muasir qeolozidə jer kabьgьnьn kəbyl edilmiş katlar sisteminə bөlunməsi beşinci sutynda qөsterilmişdur).

## ARXEIQ ERA.

Butun çөquntu katlarьnьn kajdasьnda өzul mislində granitlərdən, gnejslərdən və kristallь şistlərdən ibarət kədim kristallь suxyrlarьn qүclu katlarь vardyr. Bynlarda organizm kalьklarь jokdyr; byna qөrə də qeologlar uçun bynlar „tərixdən əvvəlqi“ qeolozi xatirələr hesab olynyr. Kabak zamanlar bynlara ərinmiş halda bylynan kьzgьn jer qurrəsi birinci dəfə olarak bərq kabьkla өrtulduqu zaman əmələ qəlmiş birinci kabьk nəzərilə bakьrdьlar. Əl-



bəttə bynynla razьlaşmak çətindur: butun jykarьdaqь çөquntu suxyrlarь kat'arь, şəqsiz jerin ibtidai kristallь kabьgьnьn dagьlma

| Verner | Inqiltərə | Almanja | Beklənd | Indiqi taksimat |
|---|---|---|---|---|
| I Jьgьnlar | | | Alluvial | Indiqi |
| | | | Dilluvial | Byzlak |
| | | | Tə!əşir ustu formasja. | Uçuncu (1760-ardino). |
| II Fløs formasjasь. | Ag təbaşir. Jaşьl kym daşь | Ag təbaşir | Təbaşir formasjasь. Jaşьl kym daşь. | Təbaşir (1822-ci d' Allya). |
| | Oolit Lejjas | | Oolit formasjasь. Lejjas formasjasь | Zyra (Bronjar-1829) |
| | „Təzə kьrmьzь kym daşь“ | Qeiper Kabьklь qirəc daşь | Qejper Kabьklь qirəc daşь Ala bəzaq kym daşь. | Triasь (Alberti-1831) |
| | | Sexştejn. Misli şist. Kьrmьzь өlu | | Perm (Myrçison-1811) |
| | Daş qөmur Dag qirəc daşь. | Daş qөmur | Daş qөmur formasjasь | Daş qөmur (Konibir-1822) |
| III Qeçib formasьasь | „Kədim kьrmьzь kym daşь“ | | | Devon (Myrçison və Secvik-1839) |
| | | | | Silyr (Myrçison-1833) |
| | | | | Qembri (Secvik 1836) |
| IV Əsasi formasja. | Granitlər, gnejslər, kristallь şistlər. | | Kristallь suxyrlar | Arxej grypy. |

məhsyllarьndan əmələ qəlmişdur. Həkiki „birinci təşəqqul etmiş kabьk“ çokdan məhv olmyşdyr; və vaktilə ony tərqib edən hissələr qillərin, kymlarьn və gejri çөquntu katlarь suxyrlarьnьn təşəqqulunə işlənmişdur.

Adət uzrə fyndamental kristallь suxyrlar çok dərində olyr; ancak bə'zən bilavasitə jerin uzunə çьkьr. Bynlar həmişə bərq dislokasjaja ogramьş olyr; bynlar jarьlьb koparak parçalanmş, buquqlərə katlanmьş, intryziv suxyrlara, damarlar halьnda işləmişdur.

By suxyrlarьn hamьsьnьn təşqil olyndygy zamana „arxeiq era“ dəjilir. Arxeiq suxyrlarьnьn çok bөjuq kalьnlьgьnь nəzərə aldьkda, arxeiq erasьnьn bynyn axьrьndan başlamьş indiqi zamana kədər qeçən vaktdan mukajəsə olynamaz bir syrətdə artьk davam etdiqi anlaşьlьr.

Içərisində kalьklar olmamagьna qөrə arxeiq katlarьnь muəjjən syrətdə kьsьmlara və təbakələrə bөlməq çətindur. Belə taksi-

matьn hamьsьnьn (dag suxyrlarьnьn fərklərinə əsasən) ancak məhəlli əhəmijjəti ola bilər.

Arxeiq katlarьnьn jykarь hissəsində ən kədim okjanyslarьn işinin şəqsiz izini ƣөruruz: konglomeratlar, ƣilli şistlər, hətta (kristal şəqlinə duşmuş) qirəc daşlarь katlarь təsaduf edilir. Antrast lajlarь, jerdə çok kədim devrlərdə organizm həjatьnьn mevcyd oldygyny ƣөstərir. Əƣər bynlara morenlərdən və byzlak daşlarьndan ibarət olan arxeiq katlarьnьn bə'zi məhəllərində tapьlan byzlak işlərinin izləri də ilavə edilsə, umymijjət uzrə çokly by kədim zamanlarьn fiziqi-cografi şərtləri indiqindən çok fərkli olmadьklarь naticəsinə ƣələ biləriz. Jer tarixinin nə kədər yzak qeçmişini tədkik edərsəq edəlim, ƣeolozi bizə nə ibtidai „kajnajan okjanysy" nə jerin daxili istisilə kьzmьş birinci jaradьlan kabьgь izah etməjir.

Ancak ən alt „katarxeiq" suxyrlarьnda okjanysyn işinin izləri ƣөrunməjir. Belə ƣөrunur qi, o zamanlar jerdə okjanys heç jok imiş; professor Pavlov, Finland kristallь suxyrlarьnь, gnejsləri, konglomeratlarь tədkik edərəq orzinal bir nəticəjə ƣəlmişdur; gnejslər və kristallь şistlərin əsilləri həmişə normal çөquntu suxyrlarьndan ibarət dejildur; bynlar ancak sonralar juqsəq temperatyra tə'siri ilə bərq metamarfoza ogramьşlar. Bynlarь, dagьlma parçalarьndan əmələ ƣəlmiş suxyrlardan sajmaga çok dəlillər vardyr; laqin bynlar ən isti və kyry iklimdə əmələ ƣəlmişdur.

Intensiv fiziqi aşьndьrmaja maliq olan kьzgьn səhralar çok bөjuq qutlələr ilə hər bir cur dagьlma parçalarьnьn, xьrlarьn, və dag suxyrlarьnьn dagьlьb tozlanarak xьrda hala ƣəlmələri uçun ən əlverişli bir sahədur; daha sonraqь təşəqqulatla өrtulmuş by məhsyllar temperatyra və təzjik tə'sirinə ogramьşlar. Həmin tə'sir onlarьn metamorfizasjasьna səbəb olmyşdyr. Metamorfizasja onlarьn katlarьna altdan kьzgьn ərinmiş magmaniq qutləsinin sokylmasь ilə şiddətlənirdi. By syrətlə arxeiq suxyrlarьnьn çokysy hər halda katarxeiq suxyrlarь dəniz dibində təşqil olmajarak ən kədim tarixdən kabakqь səhralarda təşqil olmyşdyr.

Professor Pavlovyn dediƣinə ƣөrə:

„Çьplaklanmьş dag qutləlari və həjat əlamətlərindən məhrym olan səhrala okjanyslardan daha kədim cografi tiplər oldygyndan duşunməƣə əldə subyt vardyr". Kabaklarda ƣeologlarьn təsəvvur etdiqləri butun cihan okjanysy heç vakt olmamьşdyr; „laqin birinci jaradьlan butun cihan səhrasьnьn qeçmişdə olmasьna çok ehtima vardyr. Ƣөzumuzun өnundə sy өrtuƣunun iştiraqь olmadan təşəqqul etmiş ƣөj cəsminin ƣөzəl bir modeli vardyr. By bizim jer qurrəmizin pejqi olan ajdyr. Indi isə bə'zi xusysi cografi şərtlərinin məhəlli təzahuratьndan ibarət olan səhralar jerin ancak өtə-bərisində kala bilmişdur. Onyn duşmənləri çokdyr. Bynlardan ən muhummu jer uzunun 2/3 pajьndan artьgьnь dytan okjanysdyr. Kabaklar okjanys hər çəndqi kyrylara haqim dəjildur..... gejri muntəzəm bir syrətdə kьzmьş çokly vylkanlь kyryla jequrrəsinə tamamilə haqim idi; jerin uzundəqi ən kədim səhra da həmin byndan ibarət idi".

Katarxeiq zamanьnda, ƣələcəq okjanyslarьn butun syjy ja atmosferdə və ja hələ hətta magmada olan zaman jerin şəqli belə



idi. Ancak tədric ilə jerin uzundə sy hevzələri törədi, və jerin jeni okjanys erasь başladь. Ancak jerin uzundə həjat bəşiƣi sanьlan dəniz əmələ ƣələndən sonra həkiki ƣeolozi tarix başlanmьşdyr.

**Jerin kristal zьrhь.** Arxeiq suxyrlarь, butun jer qurrəsini zьrh qibi burumuşdur. Onlar ustlərinə dөşənmiş daha sonraqь zamanlarьn çөquntu suxyrlarь altьndan ancak bə'zi jerdə jerin ustunə çьkmьşlardyr. By hallarda onlar ƣeniş kristallь qutlələr şəqlini almьşlardyr; by qutləlari Zuss adlь alim kalkan[1]) adlandьrmьşdyr.




Şəqil-86. Avropanьn tektoniq xəritəsi.

Ƣeolozi by kalkanlara indiqi kit'ələrin ən kədim hissələri nəzərilə bakьr: ƣeolozi tarixinin ibtidalarьnda əmələ ƣəlmiş və sonralar sьra daglarьn kьraklarьnь basmьşdyr. Bynlarьn by syrətlə mərqəzdən periferijaja dogry bөjuməlarindən bir-birilə birləşməsindən jerin indiqi şəqli əmələ ƣəlmişdur. O kalkanlar bynlardyr: 1) Skandinav-Finlad və ja Baltiq,—Avropada, 2) Angar (və ja Şərki-Sibir)—Asjada, 3) Kanada—Şimali Amerikada 4) Brazilja—Cənybi Amerikada və

1) Byndan başka arxeiq suxyrlarь çok vakt sьra daglarьn „kristallь mehvərini" təşqil edərəq sьra daglarьnьn yzantь çizƣisi yzyny mejdana çьkьrlar.

başkalarь; by cur iri kalkanlardan başka, kit'ələrin kyrylyşynda bir çok xьrda kalkanlar da qərməq olar. Bynlar kit'ənin qutləsinə karьşmьş qibi olyb muhum rol ojnamajьrlar. Biz „dunja hissələri" adlandьrdьgьmьz parçalar, vaktilə mustəkil təşəqqulat olan muxtəlif hissələrin mozaiqidur; okjanysyn dəfələrlə olan transgressija və regressijaları øz ıьglarь ilə bynlarь bərqləşdirmiş və bir butøv halьna salmьşdyr.

Avropanьn tektoniq xəritəsində (*şəpil*-86) by kit'ənin uç hissədən ibarət oldygyny qərməq olar: 1) Skandinav-Rysja duzənqahlarь, 2) kьrьşьklь daglarьn Cənybi-Avropa zoly (Ag dəniz sahəsi) və 3) jarьlьb kopma parçalarьndan əmələ qəlmiş daglarьn Orta- və Gərbi Avropa sahələri. Cənybi Avropanьn kьrьşьklь daglarь ancak uçuncu devrdə əmələ qəlmişdur. By Avropanьn ən cavan hissəsi olyb təşəqqulatьnь hələ kyrtarmamьşdyr; byrada vake olan vylkan və sejsmiq hadisələri də byny qøstərir. Orta və Gərbi Avropa daha kocadyr; bynyn kalьn kьrьşьklь sьra daglarь çokdan ajrь-ajrь parça qutlələr (Yels, Gars, Bohemja, Voqezi, Şvarsvald) şəqlinə duşmuşdur. Bynlar enli duz sahələri və çykyrlar ilə bir çok parçalara bølunmuşdur. Jykarьda sajьlan dag qutlələri (və həmçinin Ispanjanьn mərqəzi hissəsi, Sardinja ilə Korsika və Traqja qutləsi—Cənybi Avropada) kristal suxyrdan olan çьkьklardan ibarətdur; bynlarьn bir hissəsi sonraqь çøquntulər ilə ørtulu idi. Bynlar jer kabьgьna dərin basdьrьlmьş møhqəm dajaklar mislində olarak kьrьşьklь daglarьn istikamətini saklajьr və mejlini sapdьrьr. Təqcə Skandinavja Şimali və Şyralar Ittifakьnьn duzu hələ arxeiq zamanьnda əmələ qəlmiş kristal platformadan ibarətdur. Skandinavjanьn, Finlandьn øzundə Granitlər və gnejslər jerin uzunə çьkdьgь zaman Rysja duzlərində Ag dəniz – Fin qərfəzi xəttindən Cənyba kristal suxyrlar altьnda qizlənir və bynlarьn ustundə cur-bə-cur çøquntu təşəqqulatь toplanьr. By granit tava dəfələr ilə dəniz jatagь olmyşdyr. Qøhnə agac døşəmənin bə'zi parçalarь diqərlərindən aşagь çøqən qibi, bizim granit tavasьnda da dislokasja çatlaklarь yzyny ajrь-ajrь parçalarьn bir parasь juqsəlir və bir parasь da çøqurdu. By kajda ilə jer altь çьkьklar, çykyrlar əmələ qəlirdi. Birincilərdən xusysən muhummu Volin ilə Azak dənizinin şimal sahili arasьndaqь başdan başa kristal tavadyr (Azak-Podol çьkьkь). Byrasь ustdən çøquntu suxyrlar ilə ørtuludur; laqin onyn kristal olan kajdasь hər jerdə çaj dərələrində çьplaklanьr. Gərbi Avropanьn parça qutlələri qibi, by da Rysjadaqь jer kabьgьnьn tektoniq hərəqəti istikamətinə bøjuq tə'sir byrakmьşdyr.

By syrətlə arxeiq suxyrlar butun ən qec təşqil olan çøquntu katlarьnьn øzuludur; bynlar litosferin bərq isqeletini təşqil edir, jerin şəqlinin ən kədim xassələrini kejd edir; kit'ələrin kyrylyşynda əsas xətləri muəjjən edir.



Kalkanlardan başka jerin kyrylyşynda „qeosinklinal" adlanan gejri bir element də bylynyr. By ad, jer kabьgьnьn yzyn, laqin nisbətən dar çøqmələrinə verilir. Qeosinklinallar çykyrlar şəqlində oldyklarьndan, kalkanlarь bir-birindən ajьrьr. Çykyrlar şəqlində və reljefin mənfi elementlərindən ibarət oldyklarьna qørə bynlar dəniz jatagь vəzifəsini qørə bilirlər. Bynynla belə by qeosinklinallarda arasь qəsilməqsizin təzə-təzə çøquntulər qutləsi toplanьr. By qutlələrin agьrlьgь altьnda qeosinklinalьn dibi, yzyn çəqən çøqməjə mə'ryz kalьr. Laqin qec tez by çøqmə dajanьr və tərsinə olan proses başlanьr; qeosinklinalьn dibindən daglar ycalьr. Bynlar əvvəlcə kit'ə və okjanys litosferləri bir-birinə bilavasitə tokyndygy jerdən ibarət olan qeosinklinal sahilləri yzyny əmələ qəlir; kit'ə və okjanys litosferləri bir-birinə tokyndygy jer ərzin kabьgьnьn əjilmə (çøqmə) xətti uzrə oldygyndan byrada tektoniq kuvvələr daha asanlьkla mejdana çьka bilər. Qeosinklinalьn hər iqi kьragь yzyny sьra daglarь juqsəldiqcə, by daralьr; onyn dibi dərinləşməqə mə'ryz kalьr. Jenidən jenə sьra daglarь ycalьr; qeosinklinal daha da daralьr, by proses qeosinklinal tamam kapanana qibi davam edir. Belə qi, vaktilə iqi kalkanь bir birindən ajьran okjanys çykyry jerində yca dag silsiləsi kalьr.

Jerin şəqlinin tarixi umymijjətlə təsvir olynmyş ibtidai kalkanlarьn və qeosinklinallarьn bir- birinə olan tə'siri məcmyyndan ibarətdur.

## PALEOZOIQ ERA.

**Qembri və silyr devrləri.** Baltiq kalkanьnьn cənyb kьragь yzyny qeolozi tarixinin Qembri və Silyr dənizləri lajlalarьndan ibarət ən kədim iqi devrini tapьrьz. Bynlar bilavasitə granitlər və gnejslər uzərindədur; bynlarda ən kədim və organizm həjatьnьn tamam muəjjən kalьklarь tapьlьr; birinci dəfə olarak qembri katlarь Inqiltərədə Yelsdə aşqar edilib tədkik olynmyşdyr. Byndan az zaman sonra həmin belə katlar Gərbi Avropanьn başka jerlərində də: Belçikada (Ardenni), Almanjada (Tjyrinqija), Fransada (Bretan), Çexijada, Polşada, Ispanjada və Italjada (Sardinjada) tapьlmьşdyr. Laqin by qembrinin çьkan jerlərinin hamьsь ancak təq-təq adalar şəqlində Avropaja dagьldьgьndan bynlara qørə qembri dənizinin nə curə jajьldьgьnь təsəvvurə qətirməq çok çətindur: qembri devrindəqi jerin xəritəsi bizim uçun hələ tamam ajdьn dejildur. Ən qec çøquntulər ørtusu arasьndan dərin dəniz çykyry ilə bølunmuş Kanada və Baltiq kalkanlarьnьn silyetləri dytgyn bir halda uzə çьkьr; by dəniz çykyry indi Şotlandja olan jerdə meridional istikamətdə duşmuşdur (Kaledon qeosinklinalь). Baltiq kalkanь şərkə dogry nə kədər yzaga yzanmьş oldygyny biz səhih syrətdə bilməjiriz; laqin hər bir halda şərkdən o iqinci bir meridional qe-

osinklinalь ilə məhdyd idi; sonra by qeosinklinalьn dibindən Yral daglarь ycalmьşdyr. Yral qeosinklinalьndan sonra Şərki Sibirdə uçuncu Angar kalkanьnь qeruruz; bynyn cəny-byndaqь dəniz zoly Asjanьn by başlangьcьnь Çin kalkanьndan ajьrьr (sonra by iqi kalkan birləşmiş və tədriclə ətraflarьndan dag silsilələri kalkarak Asja kit'əsini təşqil etmişdur). Asjanьn Hindistan və Himalaj qibi muxtəlif jerlərində qembri katlarьnьn ajrь-ajrь çькan məhallərinə təsaduf ediriz: deməli qi, byradan dəniz yzanmьşdyr; laqin bynyn gərbə dogry nə kədər yzaga qetmiş, Italjada və Ispanja çequntu ertulərinin parçalarь bylynan Cənybi Avropa dənizi ilə nə kədər bitişmiş oldygy barədə səhih bir şej səjləməq olmaz. Ajdьndyr qi, belə qəsiq-qəsiq mə'lymat ilə by kədər yzak zamanьn fiziqi-cografi şərtlərini təsəvvurə qətirməq olmaz.

Biz qembri faynyndan daha kədim bir fayn bilməjiriz. Laqin bynynla barabar heç bir zaman qembri organizm aləminin organizmlər uçun başlangьc oldygyny səjləjə bilməriz. Qembri umymijjətlə həjatьn ibtidasь dejildur. Qembri katlarьnda qafi dərəcədə zənqin və çok muxtəlif hejvanat aləmi tapьrьz (*şəqil*-87). Bynlarьn arasьnda ən bəsit bir hucejrəli, bagьrsak karьnlь, diqən dərili, kyrtlarь, mollusklari, artropodlarь qeruruz; ajdьndyr qi, byrada bel sutyny olmajanlarьn baş gryplarьnьn hamьsь vardyr. Ancak bə'zi gryplar byrada ən ibtidai formalardan ibarətdur; byndan başka indi jaşajan muxtəlif gryplar arasьnda aralьk vəzijjət dytan organizmlər də vardyr. Nihajət, indiqi sistematikada jerləri çətinliqlə japьla bilən formalar da vardyr. Laqin hər bir halda şəqsiz qi hej-



Şəqil-87. Qembri dənizinin dibi və onyn saqinləri.



vanat aləmi ez inqişafьnьn birinci mərhələlərini qembridən çok kabak qeçirmişdur və qembri devrində bir sьra bir-birindən fərkli kollara ajrьla bilmişdur. Laqin qembridən kabakqь devrin suxyrlarьna kalmьş jer qurrəsindəqi həjatьn by əvvəlinci momentlərinin xatirələri, metamorfizasja ilə həmişəliq məhv olmyşdyr [1]). Qembri katlarьnda fəkərəli hejvanlar kalьgь tapьlmamьşdyr; laqin bynlar şəqsiz olmyşdyr; çunqu qələcəq silyr devrində qafi mikdarda balьklar qeruruz: əlbəttə, bynlarьn daha ibtidai sələfləri qembridə olmalьdyr. Qembridən bizlərə bitqilərin ancak ajdьn olmajan kalьklarь mə'lymdyr. Belə qerunur qi, qembrinin flory ancak sy josynlarьndan ibarət imiş.

Qeologlar muxtəlif məhəllərin qembri-silyr çequntulərini mukajəsə etməq məksədilə by sistemlərin butun katьnь ajrь-ajrь katlara bəlməqə məcbyr oldykda, butun qembri-silyr organizmlərindən daha artьk karakteriq olanlarьnь və qembri-silyr sistemləri muddətində bərq dəjişiqliqlərə ograjan bir neçə numynə seçməlidir. Bynlar t r i l o b i t l ə r i və g r a p t o l i t l ə r i seçmişlər; by organizmlər qembri-silyryn „rəhbər formalarь" („əlaməti-məxsysəsi") olmyşdyr.

Hali-hazьrda jaşamajan trilobit grypy xərçənqə bənzər (ajaklarь məfsəlli tiplərə) mənsybdyr. Bynlara trilobit dejilməsinin səbəbi ondadyr qi, onlarьn bədəni zьrha burunmuş, yzynyna və eninə uç kьsma bəlunmuşdur (*şəqil*-88). Bədənin orta hissəsi ajrь-ajrь uç mutəhərriq segmentlərdən ibarətdur; byna qerə də trilobitlər təsbeh bəcəqi qibi buqulə bilərlər. Onyn en və ja baş kalkanьnьn ust rərəfindən iri murəqqəb qezləri vardyr; laqin bynlar ilə barabar heç qezu olmajan trilobitlər də vardyr; by sonyncy hal onlarьn dəniz dibində jaşamalarьnь qestərir. Trilobitlərin bədəni alt tərəfdən gəlsəmə qejsəmə ilavələri, uzməq və diblə surunməq uçun pəncəciq ər ilə təchiz edilmişdur.



Şəqil-88. Trilobit.

Trilobitlər daş qemur devrinə kədər jaşamьşlardyr. Laqin onlar qembridə və silyrda bərq artmьşdyr [2]). Qembri devrində onlarьn muxtəlif nev'ləri kət'i syrətdə katlar sisteminin muxtəlif kьsьmlarьna daxil edilmişdur. Byna qerə də qembri çequntuləri katьnьn butunu 3 bəjuq kьsma və bir neçə daha qiçiq zonalara bəlunə bil-

1) Arxeiq suxyrlarьnьn ust mertəbələrində uzvi həjatьn ajdьn olmajan numynələrinin tapьlmasь, qeologlar tərəfindən by mərtəbələri a l g o n adlь xusysi bir sistemə ajьrmaga jol verdi.

2) Qembri çequntulərindən 282, alt silyrdan—866, ust silyrdan—482, devondan—105, daş qemur katlarьndan—15 və permdən—1 nev' trilobit mə'lymdyr.

mişdur. Byny belə beləndən sonra, o saat qembri katь ƣeologlarьn ƣezundə diri və hərəqətə maliq bir şej şəqlinə duşdu: birinci tətəbbe'çulərin nəzərincə, ala bəzəq, dolaşьk umymijjətlə bir tip kompleksli dag suxyrlarьndan ibarət olan qembri katlarь, ƣeologlarьn karşьsьnda bir-birini muntəzəm dəjişən muxtəlif katlar serijasь şəqlini aldь; by lajlarьn bir-birini dəjişməsi uzrə indi dajazlьk, ƣilli-kymly dərinliqdə bylynan qirəçli dərin olmak qibi, dəniz d'binin şərtləri tarixini ƣezdən qeçirməq olyr. Byndan başka muxtəlif təbəkə və muxtəlif məhəllərin çequntulərini mukajəsə edərqən, dəniz hevzəsinin sahil xətlərinin dəjişməsini dəniz kristal kalkanlar uzərinə jerişini və jer kabьgьnьn dərin çeqmələrini doldyrarak kalkanlar uzərindən ƣeri çəqilmələri ƣezdən qəçirilə bilər.

Ƣeolozi uçun „rəhbər fosil" sajьlan trilobitlərin əhəmijjəti jykarьda sejlənilən qibidur. Paleontolozi uçun də bynyn əhəmijjəti az dejildur. Indiqi fəkərəli hejvanlar 4 sьnьfa belunur: xərçənƣə bənzərlər, erumçəƣə bənzərlər, həşərat (becəqlər) və çok ajaklьlar. Ap-açьk ƣerunur qi, inqişaflarьna ƣerə ən juqsəq jeri dytanlar—həşərat və aşagь jer dytanlar, kyrt tipinə sьkь sьkьna jakьn olan çok ajaklьlardyr. Hali-hazьrda fəkərəli hejvanlarьn sьnьflarь bir-birindən tamam ajrьlmьşdyr. Laqin ən kədim zamanda vəzijjət belə dejildi; by barədə trilobitlərin məhv olmyş gryplarь fəkərəli hejvanlarьn ajrь-ajrь sьnьflarь arasьndaqь o murəqqəb əlakə, dolaşьgьnь açmaga imqan verə bilər. Ancak byny da ilavə edəlim qi, trilobitlərdən başka munkəriz olmyş fəkərəli hejvanlarьn t i q a n  k y j r y k  x ə r ç ə n ƣ l ə r i (*şəqil*-89), və d i v  x ə r ç ə n ƣ l ə r i adlanan 2 grypy daha jaşamьşdyr. Hali-hazьrda cəmi iqi nev' tiqan kyjrykly xərçənƣ jaşajьr. Muasir tiqan kyjryky xərçənƣlər m o i y k  x ə r ç ə n ƣ i, surfə devrində iqən trilobitlərə o kədər okşajьr qi, tiqan kyjryk xərçənƣlərin



Şəqil-89. Tiqanlь ajak xərçənƣ və onyn surfəsi.



Şəqil-90 Hemiaspis.

by kədim paleoziq xərçənq şəqillilər ilə rabitəsi ap-açьkdyr.



Ust silyr hemiaspisi qibi belə bir forma (*şəqil*-90) tərilobitlər tiqan kyjryk xərçənqlər arasьnda qeçid bir forma oldygy ajdьn bir syrətdə ƣerulməqdədur. Div xərçənƣlər ilə (*şəqil*-91), trilobitlərin arasьnda həmçinin bir rabitə vardyr: məsələn e v r i p t e r a (*şəqil*-92) adlь div xərçənƣlərdən birinin surfəsinin trilobitinə okşar formasь byna bir subytdyr. Belə qi, trilobitlər tiqan kyjryk və div xərçənƣlərdən ibarət olan fəkərəli hejvanlarьn iqi koly başьnda bir jer dytmyşlardyr; laqin diƣər tərəfdən tiqan kyjryk xərçənƣlər və həm div xərçənƣlər, bir çok barədə də erumçəq şəqillilər sьnьfьna da jakьndyr; by halda bynlar trilobitlər ilə skorpionlar arasьnda bir rabitədur. Belə olan halda trilobitlər fəkərəli



Şəqil-91. Div xərçənƣ (Eurypterus).



Şəqil-92. Div xərçənƣ surfəsi.

hejvanlarьn iqi sьnьfьnь təşqil edən xərçənqlər və erumçəqlər arasьnda rabitə təşqil edən məhv olmyş hejvanlar grypydyr. Silyr katlarьndan birinci həkiki skorpionlar bizə mə'lymdyr (*şəqil*-93).

Silyr katlarьnьn ətraflь təksimatь uçun ƣeologlar məhv o-lmyş g r a p t o l i t adlь gejri bir hejvanlardan istifadə etdilər: bynlarьn vasitəsilə silyr sistemində 30 qibi ajrь-ajrь zonalar tə'jin etməq mumqun oldy. Graptolitlər deməq olar qi, ancak silyra və qembrijə maxsys bir hejvandyr. Bynlar bagьrsak karьnlь hidroid[1])

1) Iqinci sьnьfь təşqil edən mərcanlardyr. Həkiki rif kajьran mərcanlar ancak silyryn iqinci jarьsьnda pejda olmyşdyr, və ust silyr katlarьnda mərcan qirəc daşь ƣeniş syrətdə intişar etmişdur. Paleoziq devrinin ibtidasьnda isə, mərcanlar əvəzinə rif kajьranlar t a b y l j a t l a r olmyşdyr; bynlar graptolitlər qibi həmin hidroid sьnьfьna ajiddur. Mərcanlar qibi onlar da kolonjalar duzəldirdilər; bynlarьn kolonjalarь muvazi qirəç borycyklardan ibrətdur; borycyklar enlinə ara qəsmələr ilə təksim olynmyşdyr (*şəqil*-94), bynlar butun paleoziq devrində jaşamьşlar.

sьnьfьna mənsybdyr. Bynlarьn kolonjalarьnьn kara, şitin isqeletləri karbonly və ququrtlu birləşmələr ilə zənqin şist katlarьnda tez-tez təsaduf ediləraq fьrça ilə daş uzərində çəqilmiş kəşənq şəqillər tə'sirini byrakьr (*şəqil*-95).



Şəqil-93. Silyr skorpiony.

Silyr devrində dəniz faynynda sefalopod mollusklər əhəmijjətli bir rol ojnamaga başlajьrlar; sonraqь devon devrində isə bynlarьn numynələri rəhbər formalar rolyny ojnajьr. Bynlarьn qeolozidə pəq çok əhəmijjətləri oldyklarьna qərə və onlarьn tə-



Şəqil-94. Halysites.

qamulunu tə'rif etdiqdə paleozoj həddindən kьraga çьkacagьmьza bakmajarak, onlarьn hakkьnda bir neçə sez deməlijiz.




Şəqil-95. Graptolit.

Sefalopod mollusklərin qirəç kabьklarь bir az qenəlmiş çəquq aralьklar ilə ajrь-ajrь kamara bəlunmuş borydan ibarətdur. Bəjuduqcə hejvan bir-birinin ustə kamara tiqir və həmişə ən kabakdaqьnda jaşajar; daldaqьlar isə hava ilə doly olyr (*şəqil*-96). Sifon bədənin dal ycyndan başlanarak aralьklarь dələrəq kabьkyzyny yzanьr. Sifalopodlarьn ən kədim gryplarь tamam duz kabьk-



lь idi; laqin bir sьra tədrici qeçidlər vasitəsilə duz formalar (ortoseras *şəqil*-97) əjilmiş (*şəqil*-98) və nihajət jastь spiral şəqlində kьvrьlmьş formalar ilə rabitələnirlər. By spiral şəqlində kьvrьlmьş formalar naytilid zumrəsini təşqil edir. Əvvəllər kamaralar arasьndaqь ara qəsmələr ən sadəcə çəquq saat şişəsi formasьnda idi; sonralar daş qəmur devrindən başlamьş aralьklar bir kədər də əjilir. Həmçinin bynlar təqamuı etdiqcə bə'zi naytilidlərin kabьklarь jastь spiral şəqlindən ilbizin kabьgь qibi konys şəqlinə duşur. O dikkətə lajьkdyr qi, qeolozi tarixinin muxtəlif momentlərində naytilidlərin muxtəlif gryplarь uçun regressiv inqişaf devri qirirdi və onlarьn kabьklarь jenidən sadəcə silindir formasьna duşurdu. Bə'zi naytilidlərin ibtidai formaja kajьtmasьnь onlarьn fərdi inqişafь zamanьnda kejd etməq olar: bynlarьn kabьklarь cavanlьkda jastь spiral şəqlində olyr; laqin kocaldьkca yzanьb duz bory şəqlin alьr.



Şəqil-96. Sefalopod mollusk.





Şəqil-97. Ortoseratit.

Naytilidlər ən artьk inqişafa paleozoj erasьnda çatmьşlar; laqin sonraqь devrlərdə də bynlar qeolozi səhnəsindən çьkmajьr-

lar. Həttа indi də onlarь altь nev'dən ibarət naytilys adlь bir cinsi jaşajьr (*şəqil*-99).

Alt devon devrində naytilidlər ilə barabar sefalopodlarьn daha juqsəq təşqil olynmyş *ammonoidi* adlь grypy zuhyr etmişdur. Umymi bir kajda olmak uzrə onlarьn spiral şəqilli kabьklarь



Şəqil-98. Sefalopodyn əjri formasь (Cyrtoceras).



Şəqil-99. Naytilys əz kabьgьnda.

vardyr. Kabьklarьn dənmələri qah bir-birinə azca tokynyr, qah bir-birini ihatə edir; kabьklarьn daxili (cavan) dənmələri deməq olar qi, xarici dənmələr altьnda qizlənir. Kamara arasьndaqь ara



Şəqil-100. Sefalopod mollusk.

qəsmələr daha murəqqəbləşir və əjrilir; naziq kabьklardan qerunərəq hejvanьn bədəninin xarici səthində kanadlь xət adlanan xusysi bir şəqil vardyr. Byny da kejd etməq çətin dejildur qi,



hər bir fərd əz individyal inqişafь zamanьnda cavanlьkda bəsit olan kanad xət sonra daha murəqqəbləşir. Ən kədim formalarьn kamara arasь aralьklarьnьn ortasьnь dəlib qeçən sifon, indi kabьgьn dьşarь divarьna çok vakt sarp əjilmiş jerinə dogry jakьnlaşьr. By xarici əjilmə kamarda olan hejvanьn bədəninin karьn tərəfinə yjgyndyr və by syrətlə hejvan syda uzduqdə, kabьgьnьn hava kamaralarь onyn arkasьnda jerləşir (*şəqil*-100). Ammonoidi kabьklarь çok vakt çəl tərəfdən buquqlər, zьl'lar və təpəciqlərdən ibarət murəqqəb və muxtəlif nakьşlar ilə ertulu idi və kabьgьn çələ əjilmiş tərəfində çok vakt ymyrgasь vardyr.

Devon devrində *goniatitlər* ammonidlərdən bir numynə təşqil edir. Bynlar aralьklarьnьn xusysi kyrylyşy olmagilə başkalarьndan seçilir. Goniatitlərin kanad xəttinə ustdən bakdьkda (*şəqil* - 101), məsqyn kamara istikamətindən kabьgьn agzьna dogry iləri çьkan və cavan dənmələrə tərəf qeri çəqilən hissələr qeruruz. Birincilər – jəhər və iqincilər – kanat adlanьlьr. Goniatitlərin jəhərlərinin qerunuşu dəjirmi, kanadlarьnqь sivri bir şəqildədur; muryri - zaman ilə dal-ba dal bir-birini dəjişən muxtəlif goniatitlərin kanat xətlərini bir-biri ilə dytyşdyrdykdə, ən qec qələn və murəqqəb formalar alma prosesləri zamanьnda sələflərinin qeçirmiş oldygy stadijalarьn hamьsьnь kьsaca təqrar etmişdur. Devon uçun xusysən karakter sajьlan goniatitlər triasda tamam kьrьlmьşdyr. Ony kejd etməq maraklьdyr qi, goniatitlərin bə'zi gryplarь inqişaf etdiqcə, vaktdan vaktda regressiv hərəqətə dytylyrlar; by halda bə'zən onlarьn kabьklarь tamam duz bir formaja duşurdu. Şəqsiz qi, hansь bir sefalopod grypynyn arasьnda by hadisə muşahədə edilərsə, by, o grypyn deqenerasjasь əlaməti sajьlmalьdyr.



Şəqil-101. Goniatit və onyn kanat xətti.

Sefalopodlarьn daha ali formalarь olan və trias devri uçun karakter sajьlan *seratitlər* və mezozoiq erasь içərisində pəq çok inqişaf edərəq onyn həddindən qeçməmiş olan *ammonitlər* ibtidalarьnь goniatitlərdən başlamьşlardyr. Kanat xətti murəqqəbləş-

məqə davam edirdi: seratitlərin jəhərləri kabakqь qibi dəjirmi şəqildə kalьr, kanatlar isə xьrda diş-diş olmyşdyr (*şəqil*-102); ammonitlərin jəhərləri



Şəqil-102. Seratit.



Şəqil-103. Ammonit kabьgь uzərində kanat xətti.

də qəsiq-qəsiq hala duşur; kanat xətti butunluqu ilə çok murəqqəb nakьşa bənzəjir (*şəqil*-103 [1]). Ammonitlərin kanat xətlərinin tipləri artьk dərəcədə muxtəlifdur. By əlamət kabьgьn formasь və onyn nakьşь ilə barabar muhum sistematiq əlamət sajьlьr. Hejrət olynacak bir sabitliqlə bir tip ammonitlərin ejni grypynda davam edir; ejni zamanda da bir organizmin fərdi inqişafь zamanьnda tez və kьsa bir syrətdə həmin nev'in sələfinə ajid olan stadijalarь qeçirir. Bynlarьn hamьsь bir jerdə təqamulun umymi kanynlarьnь ajdьnlaşdьrmak uçun ammonitlərin tədkikinin ehəmijjətini daha da artьrьr. Ammonitlərə okşar çok az organizm tapьlar qi, kabьklarьnda bəjumə dəjişiqliqlərinin qedişini belə dəkik bir syrətdə jaza bilsinlər. Ammonitin spiral kabьgьnь ajrь-ajrь kamarlara bəlduqdə, karşьmьzda ejni formanьn butun ontoqenezisini qeruruz. Laqin mə'lym olan biolozi kanyny uzrə, ontoqenezisi (fərdin təqamulu) filoqenezisinin (butun ejni grypyn təqamulu) kьsa təqrarь oldygyna qerə, ammonitin cavan dənmələrində, onyn surfələri hansьlar oldygyny və by surfələri alt katlarьn hansь ammonitləri arasьnda aktarmak usylyny tapa biləriz. Bir misal qestərəq; sifon kamara arasь aralьgьnь dələn jerdə, aralьkda qiçiq bir qirəç borycyk vardyr; by borycyk bir kədər məsafədə sifon ilə janaşь qedir. Sefalopodlarьn ən kədim formalarьnda belə sifon borycyklar qeri çevrilmişdur. Paleozojьn iqinci jarьsьnьn formalarьnda belə borycyklar həm dala, həm kabaga çevrilmişdur, nihajət me-

1) Kanat xəttinin və ja kamara arasь araqəsmələrinin murəqqəbləşməsi ancak mexaniqi səbəblərdən iləri qəlmişdur: hejvanьn bədəninin dal hissəsi ara qəsmələrə bilavasitə japьşьk idi və araqəsmənin səthi çok nahamvar oldykca, hejvanьn bədəni ammonitin arkasьnda olan kabьgьn havalь hissəsi ilə daha artьk nəktələrdə bitişir. By hal hejvana sabit bir vəzijjət saklamaga jardьm edirdi.



zozoja formalarьnьn belə borycyklarь ancak kabaga çevrilmişdur. Belə mə'lym olyr qi, mezozoja ammonitləri də qestərilmiş uç stadijanь da ontoqenezislərinə qeçirərəq kьsa bir syrətdə həmin təqamulu əmələ qətirirlər; cavan dənmələrdə sifon borycyklarь dala və jaşlьlrda kabaga cevrilmişdur.

Laqin ammonitlərin daxili dənmələri tədkikatь bizi bir maraklь hadisə ilə də aşna edir. Bə'zən cavan kamaralarda qezlənilməjən jeni bir əlamət tərəjir (misal uçun jeni nakьş əmələ qətirmə elementi); by kьsa bir muddət davam edərəq, sonra izsiz olarak itir. Ammonitin qələcəq ontoqenezisi ejni nev uçun adi bir jol ilə qedir. Laqin bir kədər qeolozi zamanь qəçir. Bydyr qi, ust katlarda jeni ammontilər zuhyr edir; bynlarьn by əlaməti cəddlərinin cavanlьgьnda bir azca davam edərəq jeni nev'lərdə quclənir, və əsas bir əlamət rolyna qirir. Akademiq Pavlov tərəfindən təqamulun „cəddlərə ajid stadijalarьn" tapьlьb açьlmasь, bizim qezumuzdə sələflərdən xələfələrə qeçməq uçun bir rəhbərdur və „ontoqenezis, filoqenezisin təqrarь" kanyny ilə barabar „ontoqenəzisin filoqenezisi kabaklamasь" kanyny da mejdana çьkmьş dyr. Hərqah birincisi təqamulun konservativ təndensijasь olmasьnь mejdana çьkarьrsa iqincisi progressiv başlangьcь kejd edir. Kanynlarьn iqisini də nəzərə alarak, indi dejə biləriz qi, organizmin yşaklьgь çok murəqqəb hadisədur; bynda əsqi və jeni, qeçmiş və qələcəq bir-birləri ilə təəccublu bir syrətdə karьşmьşdyr. Yşaklьk atavistiq xassələr ilə dolydyr; laqin bynynla barabar çok vakt orada qələcəq tərəkki əlamətləri qizlənmişdur; bynlar ancak butun bir şəqildə ancak yzak qələcəqdə mejdana çьkacakdyr.

Bynlarьn hamьsь paleontologlara ammonitlərin təqamulunu adətdən xaric bir dikkətlə ejrətməqə və muxtəlif gryplarьn biri birinə olan əlakəsini ajdьnlaşdьrmaga imqan verdi. Biz devon goniatitlərindən jeni-jeni ammonitlər kollarь ajrьldьgьnь, bynlarь muxtəlif istikamət uzrə bə'zilərinin tez və bə'zilərinin javaş inqişaf etdiqini, bə'zi gryplarьn vaktdan-vakta kьrьlmaga duçar olarak səhnədən çьkdьgьnь və by gryplar səhnədən çьkmazdan kabak spirallarь açьlmьş və ja mustəkim formalar tərətdiqini və kanat xətləri bəsitləşib seratit və hətta goniatit tipinə kədər çatdьgьnь addьm-addьm tə'kib edə biləriq.

Paleontologlar tərəfindən mejdana atьlmьş ammonitlərin „qeneolozi̇q şəcərəsi" jerin lajlarьna tətbik edilsə, by qeologlar uçun sabik devrlərin hevzəsini tarixi bir syrətdə tədkik etməq uçun qezəl bir vasitə ola bilər. Ammonitlərin təqamulunun ajrь-ajrь momentləri muxtəlif devrləri kejd edər; çequntulərin ejni bir zamanda olmasьnь tə'jin edəcəq və nev'lərin cografi intişarьna qerə də dənizlərin dəjişmə şəqillərini qerə biləcəqiz.

**Qembri və silyr sistemləri.** Kədim paleozojьn qeolozi̇q xatirələrinə kajьdak. Qembri və silyr çьkmalarь Rysjada Baltiq də-

nizi sahilində toplanmьşdyr. Byryg kyjylarьnьn mə'lymatь uzrə, Leningraddan cənyba dogry çьkmasьna Fin qerfəzi cənyb sahili yzyny Pskov gybernijasьnda Lovat çajь və Tver gybernijasьnda Vьşni Voloçka janьnda çьkan katlara qerə qembri-silyr katlarьnьn kyrylyşyny aşagьdaqь qibi təsəvvur edə biləriq.

Qembri sisteminin ən alt katь qej və ja abi-jaşьl qildən ibarətdur; bynda by katьn jaşьnь qestərən uzvi hejatьn azca kalьgь (rizopodyn nuvəciqi, trilobitlər və l i n g y l i adlь ən kədim braşijepod byjnyz kabьklarь) tapьlmьşdyr. By qili çeqdurən dənizin dərinliqi az imiş və şəqsiz by qilin ezu baltiq kalkanьnьn kristallь suxyrlar



Şəqil-104. Exinosferit.

məhsylydyr. Jykarьja dogry qej qilin kymy artьr (dəniz dajazlaşьr) və javaş-javaş bynyn jerini kvarslь kym daşь katь dytyr. Həmin by katda obolys adlь braşijopod kabьklarьna təsaduf edildiqinə qerə, byna obolys kym daşь dejilir. By kym daşь bullyr istehsalatьnda işlənilir. Obolys kym daşь katьnьn da ustu kara, janьcь şist katь ilə ertulmuşdur; by şist katьnda d i k t i o n e m adlь graptolit çokly təsaduf etdiqinə qerə, by kata diktionem katь dejilir və bynynla da qembri sistemi kyrtarmьş olyr.

Dəniz dajazlaşmaga davam edirdi. Onyn regressijasь xatirəsi olarak, dənizin kymlarьnda glavkonit dənələri qerunməqə başladь. Glavkonit kymlarь katьnьn fayny qembri və silyr formalarьnьn bir-birinə karьşmasьndan əmələ qələn bir fayndyr: qembri faynynyn jerini tədriclə silyr fayny dytyrdy.

Byndan sonra hevzə dərinləşməqə başladь. Glavkonit qirəc daşь katь təşəqqul etdi. Ust tərəfdən by ortoseratit qiraç daş ka-



Şəqil-105. Fin qərfəzinin cənyb sahilində qembri-silyr qəsiqi (Barisjak uzrə).

tьna və daha jykarьda exinosiferit (içərisində təsaduf edilən e x i n o s f e r i t (*şəqil*-104 [1]) kalьklarьna qerə) katьna qeçər. By katlarьn hamьsьnь Fin qerfəzinin cənybi sahilinin yçyrymlarьnda qerməq olar (*şəqil*-105), laqin Latvijada və Estonjada silyryn daha juqsəq

1) Exinosferitlər ezlərində dəniz zanbaklarьnьn və dəniz qirpilərinin əlamətlərini bylyndyran, məhv olmyş dərisi tiqanlьlar s i s t o i d grypyna daxil edilir.



təbəkələrini qerməq olar (*şəqil*-106). Byrada bynlar çokly mərcanlar ilə zənqin olarak qirəç daşьndan mutəşəqqildur. Silyryn ust katlarьnda xalis dənizdə əmələ qəlmiş belə qiraç daşь əvəzində kara qillər və çokly „div xərçənqləri" kalьklь şistlər təsaduf edilir.



Şəqil-106. Baltiq dənizi qəsiqi. Qembri-silyryn granit uzərinə deşənməsi.

Həmin by cur suxyrlarda Skandinavjada, Inqiltərədə və Şimali Amerikada da by hejvanlarь tapьrьz. Belə qerunur qi, div xərçənqlər o. zamanqь kit'ələrin sahilllərindəqi şirinləşmiş dəniz qerfəzlərinə qeçub orada jaşajьrlarmьş. Normal tərqibli dəniz syjyndan kaçarak, onlar sahillərə jakьnda jaşajьrlarmьş. Devon devrində bynlar dənizi byrakьb qetmişlərdur; onlarьn kalьklarьnь biz ancak qel çequntulərində tapьrьk.

Qembri-silyrda kərənin və dənizin intişarьnь ancak umymi bir şəqıldə biləraq, by devrlərin fiziqi-cografi şərtləri hakkьnda da bir azca səjləjə biləriz. Belə qerunur qi, o zaman iklim hər jerdə bir cur imiş; hejvanlarьn qeniş syrətdə meridional uzrə intişarьndan qerunur. Qembrinin iklimi az isti olmyşdyr; çunqu qembri hejvanlarь arasьnda kalьn qirəc isqeletli formalar az olmyşdyr. Diqər tərəfdən qembri çequntuləri arasьnda şəqsiz byzlak morenləri (Norveçdə, Çində, Avstraljada) tapьlmьşdyr. Byna qerə də umymijjətlə qembri iklim şərtlərinin indiqi şərtlərdən az fərkli olmagьnь səjləməq daha dogrydyr. Silyr iklimininin daha isti iklimi oldygyny daha artьk e'timad ilə səjləməq olar: byrada qiraç riflər kyran hejvanlar çokdyr və heç bir jerdə donmadan əsər tapьlmamьşdyr. Laqin umymijjətlə qeçmiş devrlərin iklim şərtlərini təsəvvurə qətirməq çok çətin məsələlərdən birisidur. Misal uçun silyr ikliminin isti olmagьna subyt olarak Şimali Amerika takьm adalarь qibi yzak Şimalda mərcanlarьn tapьlmasь qestərir. Laqin diqər tərəfdən silyr mərcanlarь indiqi mərcanlara bənzəmәjir və indiqi mərcanlarьn biolozisi uzrə silyr mərcanlarьndan bəhs otməqin mumqun olmasь bir az çətindur. Byndan başka bə'zi tətəbbe'çulər qestərir qi, by kutub mərcanlarь çok qiçiq imişlər; by isə o zaman həjat şərtlərinin əlverişli olmamasьnь qestərir. Belə olan halda o zaman jerin hər jerində fiziqi-cografi şərtlərin tamam bir cur olmagь hakkьnda danьşmaga ehtijac jokdyr. Hər bir halda en dajirələri arasьnda bir kədər iklim fərkləri var idi. Trilobitlərin muxtəlif gryplarьnьn cur-bə-cur cografi şərtlərə yjgyn olmasь ilə by fakt təsdik edilir. Umymijjətlə qembri silyryn fayny indi jerdə olandan daha mutəcanis

olmasь, o zaman kərə və dəniz təksimatlarьnьn indiqindən başka cur olmasь ilə izah edilə bilər.

Baltiq dənizinin şərkində qembri-silyr daha cavan çəquntulər katь altьnda qizlənmişdur. Yralda biz jenidən jenə alt və ust silyry tapьrьk. Yralda qembrinin olmagьna şəq ola bilməz, laqin qembri syxyrlarь byrada metamorfizasjaja ogramьşdyr. Byndan ust silyr çəquntuləri Karpatlarda, Volьnda, Podolda, Bessarabijada tapьlmьşdyr. Bynlarь nəzərə alarak butun qembri-silyr devrləri muddətində indiqi Yral daglarь yzyny dəniz hevzəsi oldygyny fərz edirlər; həmin byndan gərbə, Skandinavjaja dogry eninə bir kol duşmuşdur.

Çok vakt alt silyr çəquntuləri qembri katlarьna paralel olyr və ja umymijjətlə dejildiqi uzrə bir-biri ilə yjgyn lajlanma təşqil edir. Misal uçun byny biz Leningrad janьnda qembrinin silyra qeçmişi tamam tədric ilə oldygy jerdə qərə biləriz. Umymijjətlə byny da kejd etməlidur qi, alt silyr өz organizm aləmi barəsində də qembri ilə sьk-sьkьna baglьdyr. Alt və ust silyr sьkьnda isə byny səjləməq olmaz: bynlarьn fayny o kədər bөjuq fərklidur qi, bə'zi qeologlarьn by iqi kьsmь mustəkil sistem olarak hesab etmələrinə musaədə vermişdur. Byndan başka ust silyryn dislokasjaja ogramьş alt silyr ustundə, çok muşahədə edilən „yjgynsyz lajlanmasь" by iqi kьsmьn hudydynda jer kabьgь uzərində şiddətli tektoniq hərəqətlərin əmələ qəldiqini kəbyl etməqə məcbyr edir. By hərəqətlər, dəniz və kərə hudydlarьnьn jerini dejişərəq, vylkanizmdən və dag əmələ qəlməsindən ibarət olarak (qembri by barədə saqitliq devridur) alt və ust silyry arasьnda qөzə çarpan bir hədd çeqmişdur. Byny da kejd etməlidur qi, jykarьda xatьrlatdьgьmьz Kaledon qeosinklinalьnda, qembri və alt silyr muddətində, arasь qəsilməqsizin çəqən dərin sy çəquntulərini silyryn iqnici jarьsьnda dibi kabьklь kyma daşьndan və qildən ibarət olan dajaz sy çəquntuləri əvəz etdi [1]). Deməq qeosinklinalьn dibi juqsəlməqə başlamьşdь. Həmişəqi qibi by halda okjanysyn sylarь jerini dəjişməli idi. Bynlar kit'ələrin alçak jerlərini basmaga başladь; by səbəbə də ust silyr ən bөjuq dəniz transgerssijasь devri sajьlьr. Bir çok məhəllərdə ust silyr çəquntuləri alt silyr çəquntulərindən (ust silyr, alt silyr uzərində transgressiv usyl ilə jatmьşdyr) daha artьk jer dytyr. Laqin by transgressija bizim Şyralar Ittifakьna deməq olar qi, tokynmamьşdyr. Iş byrasьndadyr qi silyryn iqinci jarьsьnda butun baltiq kalkanь da juqsəlmişdur. By hərəqət өzu ilə barabar Şyralar Ittifakьnьn duzənqah konşy hissələrini də çəqərəq kalkьzmьşdyr: bynа qөrə də silyr dənizi qeri çəqilməli idi. By dəniz Yrala dogry şərkə çəqildi; byndan başka

1) Həmin byrada ən kədim skorpiona bənzər bir kərə formasь da tapьlmьşdyr.



cənyba, cənybi-şərkə, Polşaja, Volьna və Bessarabjaja,— Cənybi Rysja kristal qutləsi tərəfə də çəqildi; bynynla da silyr devrini kyrtardь.

**Devon sistemi**. Ust və alt silyryn arasьnda mejdana çьkan tektoniq hadisələri litosferin çok kuvvətli hərəqətlərinə jalьnьz başlangьc idi. By hadisələri jer qurəsi devonyn birinci jarьm devrində qeçirmişdur. By zaman kaledon qeosinklinlьnьn, silyryn axьrlarьna jakьn olarak dajazlaşmьş, dibi juqsəlmiş və byrada indiqi Şotlandijanь dytan və Norveçə yzanan dag silsiləsi əmələ qəlmişdur. Dəniz by sahədən çəqilmiş, Kanada və Baltiq kalkanlarь bitişərəq bir kit'ə əmələ qətirmişdur. By kit'əjə şimalь Atlantida dejilir. Byndan başka kaledon katlarь by kit'ənin cənybi-gərbi və cənyb qənarlarьnь dytarak, Inqiltərə, Belçika, Şimali Fransa və Almanjaja jajьlmьş və Gərbi Avropa dənizini cənyba dogry sьkьşdьrmьşdyr.

Həmişə oldygy qibi daglar əmələ qəlməsi prosesləri şiddətli vylkanizmlərlə barabar olmyşdyr. Kontinental qutlələrin juqsəlməsi (o sьrada Baltiq kalkanьnьn da juqsəlməsi), okjanysyn səthini qiçiltdi, və umymijjətlə Avropa dənizi cənyba dogry qeçdu. Jerində jalьnьz bir-birilə rabitəsiz, dajaz hoyzlar kaldь. By cur kit'ə qutlələrinin birləşməsi jerin başka sahələrində də əmələ qəldi. Ekvator mintəkəsində Gondvan dejilən bөjuq bir kit'ə əmələ qəlmişdi. Avstrljaja və Hindistandan qeçərəq indiqi Hind dənizi ilə Afrikaja kədər yzanmьşdь. Ola bilsin qi, hətta Braziljaja da tamamilə jerləşmişdi. Cənybdan Gondvan, Şimaldan Kanada-Baltiq kit'əsi (Şimali Atlantida) arasьnda gərbdən şərkə dogry Tetis dejilən qeniş bir okjanys yzanmьşdь. Byrada bir çok ada qutlələri var idi. Haman dənizin qiçiq bir kalьgь indiqi Ag dənizdur. Biz qөrduq qi, qembri və silyr çəquntulərinə ag dəniz Avropasьnьn bir çok jerlərində təsaduf olynyr. Deməq qi, qembri-silyrda Tetis çəqəqi mevcyd idi. Silyr devon ilə əvəz edildi. Tetis sahəsində isə arasь qəsilməqsizin bir tipli çəquntulər jagьlmaga başladь. Byna qөrə də Cənybi Avropanьn hər jerində, silyr faynlarьnь javaş-javaş və kət'ijjən qөzə çarpmajarakdan, devon faynlarьna qeçməsi qөrunurdu. Byralarda ejni katda ust silyr ortoseratitlərini və alt devon goniatitlərini çok tez-tez tapmak olar. Umymijjətlə belə hadisə, jer kabьgьnьn qeosinklinal əjilmələri uçun karakteriqdur. Byralarda yzyn muddət dəjişilməjən fiziqi-cografi şərtlər hөqumranlьk edə bilər.

Byradan şimalə tərəf orta Avropada iş belə dejildi; byrada kyry və dəniz mubarəzəsi dərin syly, dajaz və hətta kontinental çəquntuləri həmişə bir-birini əvəz etməq şərtləri sajəsində qeçirdi. Nəticədə təbəkələrə və katlara asanlьkla bөlunməsi mumqun olan çəquntulərin çok karьşьk qutlələrinin əmələ qəlməsinə səbəb oldy. Devon sistemi birinci dəfə mujjən edildiqi Devonşajrda (In-

qiltərə) jerdən çьkarьlanlarьn karakterilə asanca seçilməsi mumqun olan bir sьra kьsьm və təbəkələrə ajrьlьr. Almanjada Rejn sahəsində, devon sistemi təksimatь daha ajdьn syrətdə uzə çьkьr; umymijjətlə byrada muəjjən edilmiş devon təksimatь açar olarak kəbyl edilə bilir, və bynyn qeməqilə də muxtəlif jerlərdə devon təbəkələrinin nisbi jaşlarь muəjjən edilir. Xusysi faynlarь olan q e r s i n k a t l a r ь alman devonynyn əsasь sajьlьr. Devonyn ust hudydyny isə goniatitlərdən biri olan k l i m e n j a by katь muəjjən edir. Klimenjalar jalьnьz ust devona maxsysdyr və sifonlarьnьn xaricdən dejil, devrələrin daxilində duzulməsi səbəbilə başka goniatitlərdən tamamilə s e ç i l i r l ə r (*şəqil*-107).


Şəqil-107. Klimenja.

Yral devonyny alman devony ilə asanca mukajəsi etməq olar. Yralda devon sьra daglarьn hər iqi jamacьnda uzə çьkmьş qirəc daşlarь katь ilə qerulməqdədur. Byrada həm qersen fayny, həm klimenjalь katlarь vardyr. Devon çequntularinin butn serijasь qestərir qi, devon devri muddətində Yral qeosinklinalь həmişə olmyşdyr. Vaktdan-vakta onyn dərinliqi o kədər bejuq olmyşdyr qi, byrada daş əvəzinə vaktilə məşhyr Yral jaşmisini verən silisli radioljar lili çeqmuşdur. Ejni zamanda Yral fayny Gərbi Avropa faynyndan bir çok şejlər ilə də seçilirlər: by tamamilə ajdьndyr; çunqu kutub dənizindən Yral hevzəsinə asan bir syrətdə sylar sьza bilirdi və Gərbi Avropaja isə Kaledon qeosinklinallarьnьn baglanmasь ilə jol qəsilmişdi.

Yral və Gərbi Avropa arasьndaqь jerlərdə, Şyralar Ittifakьmьzьn orta və gərb hissəsində devon çequntuləri bejuq sahə dytyr və Baltiq kalkanь ilə cənybi bulyr qutləsi arasьndaqь çykyry do'dyryr. Əqər devon çequntuləri xəritə uzərilə qestərilsə, 108-ci şəqil hasьl olar. Necə qi qerursunuz rys devon dənizi Yral qeosnklinalь vasitəsilə alman dənizilə birləşmişdur. Laqin xəritə təsvir olynan fiziqi-cografi şərtləri barəsində çok umymi bir mə'lymat verir. Əvvələn kejd etməlidur qi, Şyralar Ittifakьnda aşagь devon çequntuləri jokdyr: devon devrinin əvvəllərindən Şyralar Ittifakь elqəsi kyry olmyşdyr. By vəzijjət şubhəsiz kaledon kьrьşьklьgь proseslərilə əlakədadyr. Jəkin qi, Baltiq kalkanь juqsəlirqən, ona japьşьk Rysja duzlərini də ezu ilə barabar kaldьrmьş və byradan dənizi boşaltmьş, dəniz jalьnьz Yralada kalmьşdyr. Aşagь devonyn qersin fayny Gərbi Avropadan Yrala jalьnьz by cur qeçə bilərdi. Kafkasja ətrafьndan hərlənərəq, Turqustan vasitəsilə jalьnьz orta devonyn əvvələrində Baltiq kalkanьnьn və ona tabə' Rysja platfor-



masьnьn juqsələn hərəqəti alçalan hərəqət ilə əvəz edildi. Okjanys byndau istifadə edərəq hər iqi tərəfdən—Almanja və Yral tərəfindən—əmələ qələn jer kabьgь əjilmələri bojy ilə hərəqət etməqə başladь. Bizim orta və ust devon dənizi beləliqlə mejdana çьkdь. By dənizin fayny zənqin dejil idi. Bynda Gərbi Devona



Şəqil-108. Şyralar Ittifakь devon dənizinin xəritəsi.

maxsys olan bir çok formalar jok idi. Qerunur qi, hər nə isə bir şej gərbi organizmlərin byraja qəlib çatmasьnь çətinləşdirmişdur. Qeologlar belə zənn edir qi, by dənizin dibində Belorys və Polşa sahəsində ezunə maxsys dajaz ətəbələri yzanmьş idi; by da faynlarьn mubadələsinə mane' olyrdy. Diqər dajaz sy sahəsi çok ehtimal qi, dənizin şərk hissəsində Yfa dajirəsində olmyşdyr. By ehtimal haman jerdə devon çequntulərinin oldykca xьrda olmasьna əsaslanьr.

Şyralar Ittifakьnьn devon lajlarь, Avropa duzlərinin bir çok jerlerində çьkьr: çьkan jerlərdən Karelja, Leningrad, Pskov, Novgorod, sabik Vitebsk gyberinijalarь „gərbi devon sahəsini" Kalyga, Tyla, Orlov, Voronez gybernijalarь isə „cənyb sahəsini" təşqil edir.

Devonyn ən cənybi-şərk jatagь Voronez gybernijasьnьn Bobrovsqi və Korotojaksqi kəzalarьdyr. Byralarda devon katlarь bilavasitə Şyralar Ittifakьnьn cənybi kristallь sьranьn granitini ərtur. Byradan Şimala, jə'ni Tyla gybernijasьna dogry qetdiqcə, devonyn alt katlarь javaş-javaş dərinə duşur; və nihaəjət daş qəmur lajlarь sistemi altьnda qizlənir. Aşqardyr qi, Ykrajnanьn kristal sьralarьna janaşana devon katlarь mejillənərəq şimala „duşur"-lər. Moskva altьnda onlar çok dərində jatmьş olmalьdyr. Devonyn qutləsi (kalьnlьgь 300 *m*-dan az olmajan) başlьca olarak qirəç daşlarьndan ibarətdur. Qeologlar by katь muxtəlif jerdən çьkarьlanlara əsasən (xusysən **s p i r i f e r** cinsindən) bir neçə təbəkəjə bəlmuşlərdur. By bir-birinin dalьnca qələn təbəkələrin faynlarьnь əjrənərqən, spiriferidin təqamulunə dikkət etməq maraklьdyr: aşagь təbəkələrə maxsys olarak bir nev' vardyr. Lqain sonra onlarь oradan başkalarь basьb çьkarьr. Deməq qi, dərin dənizin şərtləri yzyn muddət dəjişməmiş kalmьşdyr. Laqin uzvi dunjanьn təqamulu əz joly ilə qetmişdur.

Gərbi devon sahəsinin çəquntuləri başka cur kyrylmyşdyr. Onlar umymijjətlə devonyn orta və ust şe'bələrinə mənsyb olarak, uç mərtəbəjə ajrьlьr. Alt mərtəbə çok zaman kьrmьzь rənqli bə'zən naziq, bə'zən iri dənəli kvars və mika kym daşlarьndan ibarətdur. Bynlarьn arasьnda ara sьra (kьrmьzь və ja jaşьla çalar rənqli) qil və merqel çьnkьlь təbəkələri vardyr. By suxyrlarьn içərisində kədim kalьklar çok azdyr. Jalьnьz bə'zən jerlərdə qilin içərisində kalьklarьna təsaduf edilir. Orta mərtəbə başlьca olarak jenə qilin muxtəlif rənqli aralьk təbəkələri ilə barabar boz, sarь və ja kьrmьzьja çalar rənqli qirəc daşlarь təbəkələrindən jьgьlmьşdyr. Cibs aralьk lajlarьna da təsaduf edilir. Jerdən çьkarьlanlarьn içərisində balьk çok azdyr. Amma jymyşak bədənlilər çokdyr. Nihajət ust mərtəbə təzədən ala rənqli bir çok balьk kalьklarь ilə barabar kym daşь qilli suxyrlardan ibarətdur. Aşqardyqi, jalьnьz orta mərtəbə adi dəniz çəquntusudur. Alt və ust mərtəbələrə qəldiqdə, by ala rənqli suxyrlarь ajrь curə izah etməlidur. Bynyn uçun biz devon dənizi sahəsini byrakarak, bəjuq devon kit'əsində hequmranlьk etmiş fiziqi-cografi şərtlər ilə aşna olak.

**Devon devri.** Tədkikatçьlar Inqiltərə və Şotlandijada 6000 *m*. kalьnlьgьnda kьrmьzь kym daşь,qil, konglomerat və merqeli katь oldygyna çokdan bəri dikkət etmişlərdur. By „əsqi kьrmьzь kym daşlьklarь" adь ilə məşhyrdyr. Bynyn jatagьnьn silyr və daş qəmur sistemləri arasьnda olmasь ony, devona daxil etməqə məcbyr etdi. Bir çok zamanlar by lajlar serijasьna başka şəqlə duşmuş xьrda dəniz sahil çəquntuləri qibi bakmьşlardyr. Bir tərəfdən by dogrydyr; laqin diqər tərəfdən şubhəsiz byrada dəniz xьrda sy çəquntuləri, dəniz qerfəzi və sahil qəlu çəquntulərindən başka təmiz kontinental təşəqqulatь qəzumuzun kabagьndadyr. Byrada balьk kalьklarь ilə barabar, qəl qili, dyz və cibs aralьk katlarь və nihajət butun kyrylyşy ilə səhra çəquntulərini jada salan kym daşь və-xьr katьnь qərməq olar. Karşьmьzdaqь devon səhrasьnьn xatirəsi kьrmьzь rənqi ustun qələn by suxyrlar byrada kyry səhra havasь hequmranlьk etdiqini qestərir. Şimali Atlantida kit'əsini jyjan dəniz, həmişə səhralarla mubarəzə edir; vaktdan-vakta onyn qənar sahələrini basьrdь; kym təpələrini əz jьgьntьsь altьnda qəmərəq, dyzly qəlləri əz qerfəzləri halьna salьrdь. Laqin sonraqь momentlərdə səhra, dənizi əzundən yzaklaşdьrdь, və qənarlarьnda hali-hazьrda Kaspi dənizi və onyn Kara Bogaz qerfəzində, qərunməsi mumqun olan, hadisələr juz verirdi.

Kьrmьzь kym daşlьklarьna tamamilə bənzəjən katlar Skandinavjada, Şimali Amerikada, Afrikada və Hindistanda vardyr. By katlar umymijjətlə bəjuq devon kit'ələrinə — Şimali Atlantidaja, Gondvana mənsyb olyb, kyry səhra iklimьn umymijjətlə devon kyrylarьnьn hudydy oldygyny qestərir. Byndan başka: by cur kьrmьzь rənqli suxyrlar, jerin hər tərəfində və başka qeolozi sistemləri arasьnda da rast qəlir. Laqin byrasь gəribədur qi, həmişə onlarьn mejdana çьkmasь, okjanyslarьn regressijalar ilə məşhyr oldyklarь devrə təsaduf edir. Kyrynyn bir neçə bəjuq hissələri birləşdiqdə, onlarьn uzərində iklim kyry və kontinental olyr. By kontinentlər uzərində dənizə akьntьsь olmajan qeniş sahələr əmələ qəldiqdə, o zaman şubhəsiz byralarda səhra inqişaf edirdi və hətta dəniz jakьnlьgь da by prosesə mane' ola bilməjirdi. Belə sahələrdə jerin aşьndьrmalarь olmyş və bir çok parça materjallar toplanmьşdyr. Kьzgьn qunəş, onlarь dəmir oksidinin kьrmьzь rənqinə bojamьş və təsadufən əmələ qələn qellər də dyzlanmьş və ja tezcə kyrymyşlardyr.

Ittifakьmьzьn gərb hissəsi, Şimali Avropa devon kit'əsinə jakьn olmasь, Ittifakьmьzьn gərb sahəsinin devon çəquntuləri uzunə də tə'sirini byrakmьşdyr. Ala bəzəq rənq suxyr devon səhralarьnьn haman by səhranь jyjan dənizə galib qəldiqini qestərir. Ryssь satansijasьnьn mineral mənbə'ləri by vakta kədər devon çəquntulərindən kaliymyn və natriymyn klorly birləşmələrini qugurt kalsiym və bromly dyzlarь çьkarьr.

Kьrmьzь kym daşlarьnьn qəl aralьk katlarьnda biz maraklь bir balьk fayny tapьrьk. Hər şejdən kabak jalьnьz deməq olar qi, mustəsna bir halda devon devrinə maxsys olan **z ь r h l ь b a l ь k l a r** numynələrinin bylyndygyny və bynyn uçun də bynlar zьrhlь balьgьn rəhbər formalar rolyny ojnaja biləcəqini kejd edərəq, tamamilə məhv olmyş by grypyn sistematiq vəzijjəti butunluqlə aj-

dьn dejildur. Onlarь ajьrd edən xusysijjət byndan ibarətdur qi onlarьn sumuq fəkərat sutynlarь olmadьgь halda, ustləri sumuq zьrh ilə ertulmuşdur. By zьrh ja butun bədənini və ja jalьnьz başьnь erturdu (*şəqil*-109). Pterixtis (*şəqil*-110) adlь qəribə ba-



Şəqil-109. Zrьhlь balьk. Cephalaspis.

lьgьn bejurlərində uzqəclər əvəzində, avara okşar artьrmalar varmьş; zьrhlь balьklar çok kьsa zaman jaşamьşlar. Byda qi aşqardyr: çunqu, sumuq zьrh hejvanьn bədənini xəsarətdən korymak uçun jaxşь bir vasitə dejil idi: zьrh bejuməqə və hərəqətə



Şəqil-110. Zьrhlь balьk. Pterichtys.

mane' olyrdy. Bynyn uçun də zьrhlь balьklar, ez jerlərini, mexaniqi nekteji-nəzərdən bədənləri daha jaxşь kyrylyşly olan canlьlara verməqə məcbyr oldylar.

Devon katlarьnda zьrhlь balьklardan başka, şubhəsiz **iqi tənəffuslu** dejilən bir çok balьklarьn da kalьklarьna rast qəlirlər. Hali-hazьrda belə balьklarьn ancak 3 nev'i mə'lymdyr. On-



Şəqil-111. Seratod.

lardan birincisi **seratod** və ja **byjnyzdiş** Avstraljada jaşajьr (*şəqil*-111). Diqəri Cənybi Afrikada, uçuncusu Cənybi Amerikada jaşajьr. Avstraljanьn çajlarь kyrydykda, seratod nəfəs almak uçun uzqu ufurdəqindən istifadə edir. Ufurdəqin divarlarь bollyca



kan damarlarь ilə təchiz olynmyşdyr [1]). Periodiq kyry iklimi olan məmləqətlərdə by tərtibatьn xusysi kijməti vardyr. Byna qerə də iqi tənəffuslulərin çok bejuq səhralar devri olan devonda inqişaf etmiş olmasь təəccublu dejildur. Byrada biz jerin şəqlinin muəjjən dəjişiqliqi səbəbilə səhralarьn inqişaf etməsinə və bynynla mevcyd şərtlərə yjgynlaşmьş jeni organizm formalarь hazьrlamaga tə'sir etdiqinə dajir jaxşь misal qeruruq.

Seratodyn (1870-ildə) qəşf olynmasilə, ag cijərlə tənəffusunun mənşəi məsələsi ajdьnlaşdь. Ag cijər şəqli dəjişilmiş uzqəc ufurdəqidur. Bir çok alimlər iqi tənəffuslu balьga jer uzundəqi organizmlər ilə umymijjətlə balьk arasьnda qeçid formasь olarak bakmaga başlamьşdьlar. Laqin nəticədə by nəzərijjəni rədd etdilər. Devon, ag cijərli balьklarь inqişafьn jan bydaklarьdyr. Jerin qələcəq tarixi ərzində, ta indiqi seratodlara kədər, onlarьn nəsli əsil balьk olarak kalmьşdyr. Inqişaf duz çizqisi jer uzu formalarьnьn janьndan qeçmişdur. Gəlsəmə tənəffusundən ag cijərə qeçməq məsələsini devon devrində mejdana çьkan başka balьk grypy həll etmişdur. Biz by saat onyn adьnь deмədən əvvəl, umymijjətlə balьk sьnьfьnьn təqamulu uzərində dajanak.

Zьrhlь balьklardan başka, kalan balьklar uç əsas grypa belunur: birinci gryp **deşiq gəsəməlilər** (və ja selaxija) təşqil edir. Hali-hazьrda qepəq balьgь və pişiq balьgь by grypa daxildur. Iqinci grypy jykarьda sejlənilmiş **iqi tənəffuslulər** təşqil edir. Bədənlərində də bir dərəcəjə kədər sumuq isqeleti inqişaf etməqdə olan başka balьklarьn hamьsьnь uçuncu grypa daxil etməq olar. Byraja həkiki, oldykca juqsəq mutəşəqqil, **sumuqlu balьklardan** başka, hali-hazьrda çok zaman **ganoid** dejilən balьklarь da dax etməlidur. Ganoidləri uç dəstəjə belərsəq, daha dogry olardь: **ələq biləqli** ganoidlər, **kьkьrdьklь** ganoidlər, **sumuqlu** ganoidlər. Nihajət, sumuqlu və kьkьrdaklь ganoidləri həkiki sumuqlu balьklar ilə bir jerdə **lələq şua'lь** dəstəsinə birləşdirərəq, **kanat biləqlilər** dəstəsi karşьsьna koja biləriq. Necə olyrsa-olsyn sumuqlu balьklar təşqilatca juqsəq dərəcəni, deşiq gəlsəməlilər daha ən ibtidai gryp jerini, ganoidlər isə orta jeri dytyrlar.

Qeolozi tapgьlarь da by gryplarьn kejd olynan sьralarьnьn sistematiq bir syrətdə bir-birinin ardьnca çьkdьklarьnь təsdik edir. Əsqi balьk kalьklarь silyrda terəjən deşiq gəlsəməlilərə ajiddur. Əlbəttə silyr balьklarьnьn formalarь tamamilə muəjjən olynmamьşdyr: bynlarьn tez-tez və jalьnьz dişləri və pyllarь tapьlьr. Laqin hələ devon çequntulərində qepəq balьgьna bənzər **selaxijalarьn** (*şəqil*-112) devlətli fayny var idi. By balьklar, xusysən daş

1) Seratodyn damagьnda ezunə maxsys darak şəqlində dişləri vardyr. Devon devrində iqi tənəffuslu balьklarьn olmasь, devon katlarьnda tapьlmьş by cur dişlər uzrə birinci dəfə olarak qəşf edilmişdur.

qəmur devrində bol inqişaf etmişdur. Kejd etməlidur qi, əz təşəqqulatları e'tibarъ ilə çok ibtidai olmaklarъna bakmajarak, bynlar dənizlərdə zamanъmъza kədər kalmъşlar və hətta ən qəzə çarpan jъrtъcъlardan sajъlъrlar. Zyra devrindən e'tibarən qəpəq balъk-




Şəqil-112. Selaxija (devon).

larъna pişiq balъklarъ ilavə olmyşlar. Devon devrində balъk fayny pəq çok devlətlənmişdur: iqi tənəffuslulər, lələq biləqli və kъkъrdaklъ ganoidlər terəmişdi; belə qi alt devonlarda kъkъrdaklъ ganoidlərin numynələrindən olan x e j r o l e p i s (*şəqil*-113) tapa biliriq. Qələcəq inqişaf xətti by cur ibtidai formalardan, mezozoiq



Şəqil-113. Cheirolepis (devon).

xondrosteidlərə (*şəqil*-114) dogry qedir. Xondrostoidlər bir çok qeçidlərdən 3-cu devr və indiqi mersin balъgъ ilə birləşirlər. Əqər kъkъrdaklъ ganoidlər (formalarъ az saplъ olmasъna və ancak bə'-




Şəqil-114. Chondrosteus.

zi jerlərdə bylynmalarъna bakmajarak) zamanъmъza kədər muhafizə olynmyşlar isə də, ancak sumuqlu ganoidlərin mukəddəratlarъ jaxşъ olmamъşdyr. Bynlardan zamanъmъza kədər Şimali Amerikada bylynan jalъnъz z ъ r h l ъ və d y r n a b a l ъ g ъ kalmъşdyr. Beləcəsinə lələq biləqlərdən az numynələr sag kalmъşdyr: devonda çok bylynmaklarъna bakmajarak, lələq şua'larъn rəkabətinə da-



vam qətirəməmişlərdur. Indi Afrika çok kanatlъ və ja p o l i p - j e r (*şəqil*-115) larъ bynlarъn numajəndələridur. Həkiki sumuqlu balъklar jalъnъz triasdan başlamъş, terəmişdur. Onlarъn başlъca inqişafъ təbaşir devri ilə həm'əsr olarak indi də davam etməqdədur. Dyrna balъgъ, seldi zumrələri təbaşir devrindən sazan, çitarъ balъgъ və gejriləri uçuncu devrdən mə'lym olmaga başlajъr;



Şəqil-115. Polipter.

beləliqlə balъklarъn fayny indiqi zamanda ja ən cavan gryp olan sumuqlulərin və ja ən kədim və ibtidai gryp olan deşiq gəlsəməlilərin numajəndələridurlər. Ganoidlərin aralъk grypları aşqar bir syrətdə məhv olyrlar.

Gəlsəmə tənəffusundən cijər tənəffusunə qeçid təşqil edə biləcəq bir gryp aktardъkda lələq biləqlilər grypy uzərində dajanmalъjъk. Onlarъn nə inqi iqi tənəffuslulərlə, hətta həkiki iqi həjatlъlar sъnъfъ ilə (amfibilərlə) okşajъş əlamətləri vardyr. Onlarъ deşiq gəlsəməlilərə jakъnlaşdъran, bir sъra ibtidai nişanələrə bakmajarak, təşəqqulatlarъnda qələcəq amfibiləri andъran bir çok şejlər vardyr. Polipterin uzqəc ufurdəqinin kyrylyşy xusysən maraklъdyr: by, iqi torbadan ibarətdur. Birisi deşiqə bənzər kapъsъ ilə karnъ tərəfinə (başka balъklarda oldygy qibi dal tərəfində dejil) açъlъr. Xusysi əzələlər by kapъnъ sъkъb açъrlar. Bir cift ətrafъnъn daxili isqeleti çok massivdur, və qəzə çarpъr qi, polipter əz uzqəcləriIə pəncə qibi hoyzyn dibinə səjqənərəq onlardan istifadə edir. Nihajət amfibilərdə oldygy qibi polipterin surfələrində xarici lələqli gəlsəmələri vardyr. Xulasə, lələq biləqlilər başka balъklarъn hamъsъndan asanlъkla iqi məişətlilərin ibtidasъ sajъla bilər.

Kъkъrdaklъ balъklar lap kədimdən var idilər və indi də dənizlərdə jaşajъrlar. Laqin mə'lym oldygy qibi, onlarъn uzqəc ufurdəqləri jokdyr. Ganoidlər və sumuqlu balъklar, jəkin qi şirin sy hevzələrində terəmişlərdur (ynytmamalъ qi, nəticədə bir çok balъklar dənizə kajъtmъşlar). Cijər vəzifəsini qerən uzqec ufurdəqinin kədim şirin sy iqi məişətlilərində və lələq biləqlilərdə olmasъ by vəzifənin onyn ibtidai vəzifəsi oldygyny qəstərir. Jalъnъz dənizə kajъtmak nəticəsində balъklarъn juqsəq numynələrinin ufurdəqləri hidrostatiq aparatъna çəvrilmişdur. Bynynla barabar ətraf massiv isqeletlərin itirilməsi (lələq biləqlilər tipinin) və onlarъn,

ləlaq şua'larьn junɋul isqeletlərilə əvəz edilməsi, balьklarь dənizdə daha jaxşь uzməɋə yjgynlaşdьrmьşdyr. „Laqin by ixtisaslaşma, ejni zamanda təqamulun sony olmyşdyr. Ətraflarьn və uzɋu ufurduɋlərinin transformasjasilə lələq şua'lьlar uçun kyryja çьkьş joly baglanmьşdyr. Atmosfer havasь tənəffus edən və xalis jer uzu təşəɋɋulatь olan organizmlər daha by əsasdan inqişaf edə bilməzlər" (Syşqin).

Əsil iqi məişətli amfiblər ancak daş qemur devrində inqişaf etmişlərdur. Devon iqi məişətliləri və lələq biləqlilər onlarьn sələfləri idi. Kyryny organizmlər tərəfindən əldə etməq məsələsi birinci dəfə devonda nevbəjə kojylmyşdy. Hejvanlarь sy təbiətinin haqimijjətindən azad etməq prosesi, birinci dəfə olarak devonyn ɋellu səhralarьnda başlanmьşdь; „hər şeji məhv edən kyraklьk jeni həjatьn başlangьcьnь verdi" (Valter).

**Daş qemur devri (karbon).** Daş qemur devri adь umymijjətlə o zamanьn ən maraklь və lazьmi təşəqqulatь olan daş qemur hakkьndaqь təsəvvurat ilə birləşir. Əvvələn daş qemur katlarьnьn karbon sisteminin başlьca uzvu oldygyny duşunməq tamamilə janlьşdyr. Karbon katlarь içində qemur jalьnьz naziq aralьk katlarь halьnda jatьr, və „daş qemur sistemi katь" ifadəsi tamamilə „daş qemur katь" deməq dejildur.

By devrdə qemur jalьnьz muəjjən şərajit altьnda olarak, bə'zi jerlərdə, bataklarda, ɋellərdə, az syly dəniz qerfəzlərində əmələ ɋəlmişdur. Qemurun by cur şərtlər altьnda əmələ ɋələn jataklarь başka ɋeolozi devrlərində də ola bilərdi. Byna bakmajarak jenə karbon ancak qemur əmələ ɋələn vaktda olmyşdyr. By faktь ajdьnlaşdьrmak tələb edir.

Daş qemur devri fevkəl'adə ɋuclu daglar əmələ ɋəlməsi zamanьdyr. Deməq olar qi, butun jer kabьgь (arxej zamanьndan bəri) ɋerulməmiş bir hərəqətə ɋəlmiş və dunjanьn hər tərəfində kuvvətli dag silsiləlari mejdana çьkmaga başlamьşdь. Gərbi Avropada Kaledon daglarьnьn qənar kьragьndan Inɋiltərə, Fransa, Belçika, Almanjada jer kabьgьnь dert tərəfdən əzən ɋ e r s i n k ь r ь ş ь k l a r ь əmələ ɋəlmişdi. By kьrьşьklar iqi istikamət uzrə yzanmьşdь (*şəqil*-116)—a r m o r i k a n v ə v a r i s s i. Onlarьn kalьklarь indi ortaja Avropanьn kajalьklь daglarь olan Bretan, Ardenni, Garsi, Voɋezi, Şvartsvald və gejri daglarь təşqil edir. Amerikada—Allegan, Rysjada—Yral, Asjada—jeqə Altaj sistemi ycaldь; həmişə odlygy qibi belə hallarda bir tərəfdən vylkan fəalijjətini artьrdь; vylkanlar atmosfərə pəq çok mikdarda karbon tyrşysy verirdi və o biri tərəfdən də okjanys jerini dəjişirdi.



Okjanysyn dibi bir jerdə bərq çequr, ɋeniş və dərin syly çykyrlar əmələ ɋəlir. Laqin sylarьnь başka jerlərdən byraja çəqərəq, ezunun az syly qənar hissələrinin diblərini çьplak byrakьrdь. Kit'ələrə isə dənizə az mejilli çeqəq, duz jerlər ilavə oldy. Byralarda nihajətsiz bataklar əmələ ɋəldi. Kyry və dəniz mubarəzəsində sahillər gejri-sabit olyb, onlar əldən-ələ qeçən qibi olyrdy; ɋah dəniz onlarь doldyrdy, ɋah onlar kyryja japьşьr idilər. Byrada isti və rutybətli iklim səjəsində ɋejərtilər çok inqişaf etdi. Ɋejərtilər karbon tyrşysyny intensiv bir syrətdə təhlil edərəq oksizeni atmosferə kajtarьrdь, karbony isə ezlərinə jьgьrdь; onlar məhv olyb ɋemuləraq bataklьklarьn və ɋellərin diblərində çurujurdulər. Laqin onlarьn sy altьnda təhlil olynan kalьklarьna oksizen çata bilməjirdi. Çurumə axьra kədər jə'ni qemuru tamamilə qemur tyrşysyna çevirənə kədər ɋedəməjirdi; uzvi birləşmələrin karbon tyrşylarь tamamilə ɋejərti liflərindən azad olamadь. Hoyzlarьn dibində jьgьldь. Onyn daş qemur formasьnda çeqməsi beləcə əmələ ɋəldi.




Şəqil-116. Armorikan və varissi kьrьşьklarь (Borisjaka ɋerə).

Beləliqlə qemurun əsasь olan karbony, dag əmələ ɋəlməsi proseslərilə açьlmьş jer nuvələri məjdana çьkarmьşdь. Haman karbon sylarьn dyrgynlygy və rutybət artьklьgь səbəbilə jerin ustundə jьgьldь. Qemur təşəqqulu təbiətdə bir nev' maddə mubadələsini pozmakdyr. Karbon, fasiləsiz dəvəran (jə'ni atmosferdən bitɋilərə, bitɋilərdən hejvanlara, hejvanlardan jenə atmosferə kajьtmak) əvəzinə

qənara çькьr. Hər hansь bir dalana duşərəq, hoyz dibinə çequr. Normal təbiət prosesinin pozylmasьna o zamanьn i q i m ə i ş ə t l i l ə r i n şərtləri səbəb olmyşdyr. Daha qiçiq mikjasda torf olan jerlərin hamьsьnda indi də beləcədur; by karbon şərtləri içərisində bejuq bir hadisə olmyşdyr.



Şəqil-117. Daş qemur əjrilti otlarь (ajь deşəqləri)

Kyryda iş belə idi. Laqin dənizdə də byna bənzər prosseslər qeçirdi. Dəniz syjynda məhlyl halda bikarbonit kalsiym $Ca(HCO_3)_2$ vardyr. By cur birləşmə ilə—rabitəli karbon tyrşysy ilə—atmosfer karbon tyrşysy mikdarь arasьnda muəjjən və sabit bir tənasub vardyr: əqər bitqilərin fəalijjəti sajəsində havada karbon tyrşysy azalarsa, o saat bikarbonit kalsiymyn bir hissəsi aşagьdaqь muadələ uzrə təhlil olynyr: $Ca(HCO_3)_2 = H_2O + CO_2 + CaCO_3$. Sərbəst karbon tyrşysy isə havaja daxil olyr. Orada haman gazьn jerini doldyryr; $CaCO_3$ isə qiraç lili şəqlində dənizin dibinə çequr. Beləcəsinə dənizin dibində karbon çequntusu əmələ qəlir. Daş qemur devrinin dəniz qirəc daşlarь qemurlərdə oldygy qibi atmosferdən çəqilmiş karbonyn çequntu formasьdyr. Byrada biz kit'a topragьnьn qimjəvi proseslərdə dənizin dibilə nə kədər sьkь syratdə əlakədar oldygyna dajir misal qeruruz.



Şəqil-118. Sigillijar.

Karbonyn fiziqi və cografi şərtlərinin umymi „iqi maişətli“ karakteri ez tə'sirini o devrin fayn və florlarь uzərində byrakmalь idi. O zamanьn zənqin və muxtəlif flory başlьca olarak toz toxymly (qizli cutləşənlər) bitqilərdən—ajь deşəqi, kyrd ajagь və katьr kyjrygyndan ibarətdur. By gryplar by zamandaqь numajəndələrinə okşamajьrlar; onlar çok bejuq olmyşdylar. Əjrilti otlarьndan başka (*şəqil*-117) bizə juqsəqliqi 30 metroja çatan agaca bənzər, kyrd ajagь s i g i l l i j a r l a r (*şəqil*-118), l e p i d o d e n d r o n l a r (*şəqil*-119) mə'lymdyr. 2 metroja kədər eni olan lepidodendronlarьn qejdələri bir xejli hundurluqa kalkarak iqiləşir və japraklarьn japьşdьgь jerləri karakteriq romь şəqlində qərənlər halьnda çəp



sьralar uzrə duzulmuş olyr. S t i g m a r i adь ilə lepidodendronlarьn sigllijarlarьn xusysi və jastь qeqləri təsvir olynmyşdyr; qerunur qi, bynlar haman agaclarьn lilli toprakda məhqəm dyrmalarь uçundur. Agac qerunuşlu katьr kyjryklarь, k a l a m i t l ə r (*şəqil*-120) də qestərilmişdur. Nihajət, k a r b o n y n əsqi agac cinsinə k o r d a i t l ə r karbonyn agac cinsinə daxildur. Bynlarьn silindir şəqlindəqi qejdələrində paralel damarlarla ertulmuş yzyn baftə şəqlində japraklarь vardyr. Ehtimal qi, kordaitlərin sago ilə kohymlyk əlakələri olmyşdyr. Laqin daha çok ehtimal vardyr qi, onlara tiqan japraklьlarьn sələfi qibi bakmak olar. Bitqi qainatьnьn bv divləri, japraklar və qeqlər sisteminin bejuq inqişafilə seçilirlər. By da təbəxxur işinin quclu qedişini qestərir. Əqər byna qejdələrində, jə'ni bejumələrinin periodiq olarak dajanmasьnь qestərən illiq halkalarьn olmamasьnь, butun by floranьn kyryda çok bejuq bir sahədə kət'ijjən bir cinslь oldygyny da ilavə edərsəq, o zaman karşьmьzda kyrşaga kədər syja batmьş tropiq məşələrin mənzərəsi hasьl olar: by məşələrdəqi şərajiti nə ilin fəsilləri və nə də cografi en dajirələri dəjişdirə bilməzdi.


Şəqil-119. Lepidodendron

Butun by təsvir olynan bitqilər daş qemur təşəqqulu uçun materjal əmələ ·ətirmişdur.

Qemurun b 'dən əmələ qəldiqini elm daha çokdan təsdik etmişdur və qeolozi da „torf-antrasit“ teorijasь vətəndaşlьk hakkьnь almьşdyr. Onyn əsasь, daş qemurun tortdan əmələ qəlməsini izah etməqdən ibarətdur. Dogrydan da mineral janacak arьn başlьca nev'lərini qeolozi jaşlarь uzrə bir sьraja duzməq çətin dəjildur; torf by sьranьn ən cavan uzvudur və indi də əmələ qələ bilir. „Əsmər qemur“ isə kajda uzrə uçuncu və mezozoiq lajlarda rast qəlir. Əsil daş qemur başlьca olarak palezoja və nihajət, antrasit paleozoja və hətta paleozojdan kabaga maxsysdyr. Aancak by kajdadan qənar bir çok istisnalar qestərməq olar: Moskva cəvarьndaqь paleozoj jaşlь qemurlər xassəcə əsmər qemurə daha jakьndyr. Hal by qi, onlarьn jaşьdь olan Don qemurlərində antrasit xassəsi vardyr. Saxalinin uçuncu devr qemuru əsil paleozoiq qemurdən heç seçilməz. Xulasə qemur hakkьnda belə deməq olar

qi, bir tərəfdən onlar ɵz inqişaflarьndan ƣeri kalmьşlar, o biri tərəfdən ɵz zamanlarьndan irəli ƣetmişlərdur. By istisnalarь jer kabьgьnьn tektoniq hərəqətlərinin səbəbi olarak izah etməq olar. Ƣuclu təzjiklər qɵmurlu dyzlarь ɵzlərilə barabar suruqləjərəq, qɵvşəq qɵmurlu maddələrin bərq daş halьna ƣəlməq prosesini tezlən-



Şəqil-120. Kalamit.

dirir. Şpring təcribə ilə 6000 atmosfer təzjik altьnda torfyn daş qɵmurə bənzər kara və parlak bir qutləjə çevrilməsini isbat etmiş dur.

Torfyn daş qɵmurə çevrilməsi, jalьnьz bitƣi qutlələrinin sьkьlmagьndan (bərqilməsindən) ibarət olmajьb, onlarьn qimjəvi dəjişilmələrindən asьlьdyr. By proses qutlədə oksizenin, hidrozenin və azotyn karbon hesabьna olarak azalmasьndan və onynla da dojdyrylmasьndan zənƣinləşdirilməƣindən ibarətdur. Aşagьdaqь cəd-



vəldə muxtəlif janacakda olan başlьca unsurlər fajizinin mikdarь ƣɵstərilmişdur.

| | Karbon | Hidrozen | Oksizen | Azot |
|---|---|---|---|---|
| Agac . . . . . . . . . . . | 49 - 50 | 6 | 43—44 | 1 |
| Torf . . . . . . . . . . . . | 50—64 | 4—6,8 | 28,6—41,1 | 0—2,6 |
| Əsmər qɵmur . . . . . . | 50—75 | 4—8 | 12—37 | |
| Daş qɵmur . . . . . . . | 80—85 | 5—6 | 8,3—14,5 | |
| Antrasit . . . . . . . . . . | 91—96 | 1,2—7 | 2,8—4,5 | |

Sellulozyn daş qɵmurə çevrilməq prosesini qimja dilində aşagьdaqь muadələ ilə ƣɵstərməq olar:



$$4(C_6H_{10}O_5)=7CH_4+8CO_2+3H_2O+C_9H_6O.$$

Torf-antrasit teorijasь nə kədər sadə və nə kədər həkikətə yjgyn olsa da, by axьr zamanlarda çok ciddi e'tirazlara ƣɵrə onyn haqim mevkei jerindən ojnadь. Bildiƣimiz uzrə torfyn təşəqqulunun başlьca materjalь josynlardyr (kabarьk torflyklarda sfagnym, mustəvi torflyklarda isə ƣipnym). Bynynla barabar daş qɵmur lajlarьnda nə inqi josyn, hətta onyn izi də jokdyr. Sonra torf sojyk və rutybətli şərajiti altьnda çɵqur; bynynla belə karbonyn iklimi tropiq olmyşdyr. Deməq qi, torf və qɵmurun ibtidai materjallarь və təşəqqulu şərajiti tamamilə muxtəlif idi. Torf jer kabьgьnda jalьnьz indiqi şərajitə maxsys karbon çɵqməsi tipidur; və bizim torfymyza istinad edərəq karbon qɵmurləri hakkьnda muhaqəmə jurutməq dogry olmaz. Byny da ynytmamalь qi, çurumə həjatь—qimja prosesidur və jalьnьz bakterjalar iştiraqilə mumqun ola bilir. Izləri daş qɵmurlərdə olan bakterijalar hakkьnda axьrьncь illərin təhkikatь bizə çok materjallar verir. Elə belə də ƣɵzlənməli idi; daş qɵmur bakterijalarь, indiqi torflyk bakterijalarь ilə bir dejildur. Beləliqlə torf əmələ ƣətirən amillərin heç biri tamamilə paleozoiq qɵmur təşəqqulu proseslərinə qeçirilə bilməz: muxtəlif mikro-organizmlərin həjat faəlijjətini cur bə-cur şərtlər altьnda və cur-bə-cur bitƣi liflər uzərində muxtəlif nəticələrə ƣətirib çьkarmaja bilməzdi. Qɵmur miljonlarca il byndan kabak da torf olmamьşdyr.

Daha da irəri ƣede bilərig: sɵzun ƣedəƣi təbiətdə bircə nɵv' „qɵmur" jokdyr. Ona ƣɵrə də onyn mənşəi hakkьnda da bircə teorija ola bilməz. Qɵmur də bir dag suxyrydyr. Kymlarь dəniz, çaj (kym təpəsi) və ja byzlak kymlarь dejə ajьrdьgьmьz qibi, qɵmurun də muxtəlif tiplərini ajrь-ajrь seçməlijiq. Onlarьn mənşəi məsəiəsini həll edərqən, paleozoiq zamanьnьn yzaklьgьna ƣɵrə, əlbəttə bə'zən bir çok məchylly məsələlər həll etməq məcbyrijjətində kalacagьz.

Texnika çokdan daş qemuru xassəcə texniqi kijməti uzrə bir neçə nev'ə ajьra bilmişdur. Yçan maddələrin mikdarь və alavlarьn karakteri uzrə, daş qemuru arьk jaglь və gazlь (yzyn alavlь) dejə ajьrьlьr. Qemurdə hidrozen və oksizen nə kədər çok olarsa kyry distile zamanь yçan maddələr də o kədər çok olyr; çok tustu verir və alavь yzyn olyr. Qemurun by nev'i çok istiliq verə bi-t maqinə qerə. kazanlar uçun; o birisi isə ev dolanacagьna a' dəmirci işinə işlənir. Antrasit tamamən başka xasələrə maliqdur. çirqlənmәjir, jarьm metal parlaklьgь vardyr, tustusuz janьr, zəik ışьklь alavь vardyr, çətinliqlə kьzarьr, yçan maddələri və qulu az olyr. Ən az sьk olan əsmər qemur grypyndan lignitlər ajьrd edilir. Bynlar qemurlaşmiş bəjuq odyncak qutlələrindən ibarətdur.

Cildi tədkikat qestərir qi. qemurun muxtəlif tiplərinin mənşə'ləri tamamilə muxtəlifdur. Qemurun ən jaxşьlarьndan birisi olan bogxed—şubhəsiz qi, sy josyny kalьklarьndan, o biri nev'i qennel qemuru—qizli toxym'anan bitqilərin jьgьlmasьndan əmələ qəlmişdur. Bynlarьn iqisi də çok yçan maddələr verirlər. Fəkət onlardan birincisi parlak, iqincisi isə dytgyn rəqlidur. Başka nev' qemurlərin əmələ qəlməsində japraklarьn, odyncaklarьn və ja da hər iqisinin jьgьlmasь bəjuq bir rol ojnamьşdyr.

Muxtəlif qemurlərin əmələ qəlməsinin topografi şərtləri də az muxtəlif dejildi. Əqər torf jer uzu şərajiti altьnda bataklarda əmələ qəlmişsə, o halda hamьsьnьn olmasa da, əsmər qemurun (və lignitlərin) də by syrətlə əmələ qəlmiş oldygyna dajir əlimizdə butun əsaslar vardyr. Çunqu byzlak çequntuləri kətlarьnьn bir çok jerlərində əsqi torf və lignitin nevbəti təqrar olynan lajlarь kalmьşdyr. Lignitlər torf ilə əlakədar olmasь, torf əmələ qəlmə prosesinin muvəkkətən arasь qəsilməsinə, və meşə formasjasьnьn bataklar uzərindəqi galibijjətini qestərir. Bogxed və qennel qemurlərinə qəldiqdə, bynlarьn hər halda qeldə əmələ qəldiqlərini hesab etməlidur. By qemurlərə sapropel qemurləri adь verilir. Xьrda və syda uzən bitqi və hejvan organizimlərindən qelun dibində əmələ qəlmiş hulmi qutləjə sapropel dejilir. Sapropelin əmələ qəlməsini (*şəqil*-121) bitqi ilə ertulən qellərdə qerməq olar. Belə qi, bir tərəfdən sy elu organizmlər ilə dolyr, o biri tərəfdən isə, qənardan suruqlənən bitqilər altьnda qemulurlər. Qennel qemurunda isə sapropel əsas qutləni vermişdur qi, by qutləjə sonradan paleozoiq qelləri qənarьnda qejərmiş agaclarьn sporlarь birləşmiş dur. Əsil daş qemurlərin (onlara çok vakt gymys qemuru dejirlər) bir hissəsi qellərdə (by bir çok fransa batklarь uçun musbət olarak isbat olynmyşdyr), bir hissəsi isə daş qemuru dənizlərinin az syly qerfəzlərində (limanlarьnda) əmələ qəlmişdur. By tip qemurlər daha



artьk jajьlmьşdyr. Daş qemurun qilli və kym daşlarь adi dəniz çequntuləri ilə lajlanmasь haman daş qemurunun mənşəinin by




Şəqil-121. Qelun bitqi kalьklarь ilə dolmasь.

cur olmasьnь qestərir. Beləliqlə qəmur əmələ qəlməsinin uç əsas tipi aşagьdaqь cədvəldə [1]) qestərilmişdur (190 səhifədəqi cədvələ bakьn).

Jykarьda səjlənilənlərdən mə'lym olyr qi, jerdən çьkarьlan janacaklarьn hamьsь bir-birilə rabitəli dəjildur. Mumqundur qi,

1) Arber, Естественная история угля.

torf muryri-zamanla əsmər qəmurə çevrilə bilsin. By çok mumqundur. Laqin əsil əsmər qəmur ilə daş qəmur arasьnda by cur

| Karə təşəqqulatь (batak) | Dəniz təşəqqulatь (limanlar) | Ɋəl təşəqqulatь |
|---|---|---|
| Torf | | Bogxed |
| Əsmər qəmur | | Qennel |
| (Lignitlər) | Gymys qəmurləri | |

qeçid kət'jjən ola bilməz. Hətta ɋeolozi zaman fasilələri də byny edə bilməz. Antrasitə ɋəldiqə, onyn mənşəi məsələsi hələliq açьk kalmьşdyr. Antrasitin metamorfozlaşmьş daş qəmur olmasь mumqundur: heç olmazsa ɋuclu dislokasja olmyş jerlərdə və japusqurmə suxyrlarьn damlarь hudydlarьnda qəmurun antrasitə bənzər qutləjə çevrildiɋini muşahədə etməq mumqun olmyşdyr. Bəlqə də antrasit mustəkil olarak əmələ ɋəlmişdur. Antrasit janarqan deməq olar qi, qul verməməsi, antrasit əmələ ɋələn bitɋi ilə adi qəmur əmələ ɋələn bitɋi arasьnda bəjuq və əhəmijjətli təfavut olmasьnь duşunməɋə məcbyr edir.

Bə'zi nev' qəmurlərin dəniz dibində də əmələ ɋəlməsi imqan xaricində dejildur. Məsələn, Karaib dənizinin 1800 metro dərinliɋində tapьlmьş bitɋi maddələri jьgьnlarьnьn qəmurun başlangьcь verməlari tamamilə mumqundur və ola bilsin qi, bə'zi devon qəmurləri by curə əmələ ɋəlmişdur.

Qəmurun, qəmur jataklarьnьn bylyndygy jerdə əvvəlcə ɋəjərmiş bitɋilərindənmi əmələ ɋəldiɋini və ja by bitɋilər ɋəjərdiqləri jerlərdən akьntьlar vasitəsilə ɋəllərə və dəniz qərfəzlərinə ɋətirildiqləri barəsində by jakьnlarda mubahəsələr olmyşdyr. Jataklarьnda tapьlan şakyli agac ɋəjdələri, qəmurlərin bir cinsli və təmiz olmasь, içərisində kym, daş və ɋil katьşьklarь bylynmamasь, birinci ehtimalьn duzɋun oldygyny ajdьn bir syrətdə ɋestərir. Hali-hazьrda hər iqi curə də əmələ ɋəlməɋi mumqun hesab edirlər: liman qəmurləri əqsərijjətlə haman limanda jaşamьş bitɋilər hesabьna əmələ ɋəlmişsə də, laqin bə'zi ɋəl çəquntu qəmurlərinin başka jerdən ɋəllərə bitɋilərin suruqlənməsi joly ilə əmələ ɋəldiɋi rədd olynmaz bir syrətdə isbat olynmyşdyr.

Torf-antirasit teorijasьna bir e'tiraz daha vardyr: torfyn daş qəmurə çevrilməsi mumqun isə, o vakt bynyn uçun çok bəjuq zamana ehtijac vardyr. Hal by qi, bə'zi muşahədələr qəmurun, teorjanьn tələb etdiɋi aralьk etaplarь qeçərəq, ɋedəq zaman ərzində əmələ ɋəlməsini mumqun hesab etməɋə məcbyr edir. Belə qi, qəmur katlarьnda tapьlmьş bə'zi qəmur konglomeratlarь ɋestərir qi, qəmur əvvələn, əmələ ɋəlmiş, sonra, dənizlə jyjylmyş və təzədən dəniz çakьlь şəqlində çəqmuşdur, və by proses də tamamilə daş qəmur devri ərzində olmyşdyr.



Biz, jykarьda karbon içində bitən bitɋi gryplarьnь sajdьk. By bitɋilərin əz biolozi̇q karakterləri ilə onlarьn i q i  m ə i ş ə t l i olmalarьna ɋəz jetirməməq olmaz. By vakta kədər əjrilti oty katьr kyjrygy və kyrd ajagьlarьn inqişafь syly vəsatlərlə baglь olmyşdyr. Bizim əjrilti otlarьnьn inqişafьnь jada ɋətirəq: onlarьn sporlarь nəmişli topraga duşməlidur. By jerlərdə ɋəjərib pəhrən əmələ ɋətirirlər. Pəhrənin alt uzərində erqəq tənasul organь—anteridi və dişi tənasul organь—arxegon əmələ ɋəlir. Ɋələcəq majalanma prosesi isə jalьnьz maje içərisində ola bilər və jalьnьz byndan sonra majalanmьş ana hucejrədən, kyry əjrilti oty əmələ ɋəlir. Birinci etap inqişafьnьn syja belə yjgynlygy, amfibilər (kyrbaga, triton, qərtənqələ) qibi surfəsi syda jaşajan və bir sьra balьk təşqilatь əlamətləri (gəlsəmə, iqi xanalь urəq, uzɋəc kyjrygy) olan fəkərəli sьnьfьnьn inqişafьnь jada ɋətirir. Byna ɋerə də aşqar olyr qi, amfibilər ɋizli majalanan bitɋilər sьrasьnda olarak, karbon organizmləri uçun çok karakteriqdur. Onlar by devrin, umymi iqi məişətlilərinin xassələrini əzlərində in'iqas etdirirlər. Əɋər Moskva cəvarьndaqь daş qəmur jaşьnda olan ag qirəc daşь və çurumuş əjrilti otlarьndan əmələ ɋələn kara qəmur bir-birilə baglьdyrlarsa o zaman by əjrilti otlarь daş qəmur amfibilərilə də beləcəsinə baglьdyrlar. Butun by bir-birlərilə yjgynlaşmьş hadisələr fiziqi və biolozi şərtlərinin birliɋini ɋestərir.

Amfibilərin birinci tərəmə əlamətləri devon zamanьnda olmyşdyr. Laqin devonyn kyry iqlimi ehtimal qi, onlar uçun əlverişli olmamьşdyr. Jalьnьz karbonyn iqi məişətli şərtləri duzəldiqdən sonra, amfibilərin dəvlətli inqişafь başlamьşdyr. Paleozoiq amfibilər s t e g o s e f a l l a r grypyna maxsysdyr. Onlarьn içərisində qərtənqələjə okşajan b r a n x i o z a v r (*şəqil*-122) qibi xьrda formalar və çok qərrə l a b i r i n t o d o n t l a r[1]) qibi çok irilər də vardyr. Axьrьncьlar by adь dişlərinin gejri-adi bir mina ilə ərtulu olmasь munasəbətilə almьşlardyr (*şəqil*-123); laqin by amfibilərin həqumranlьk devri çok yzyn çəqməmişdur. Ən iri amfibilər perm devrinə maxsys olsa da, onlarьn son dərəcə ixtisaslaşmalarь by tip təşqilatьn və muhit şərajitinin yjgynsyzlygyny ɋestərir: devon iqlimindən daha kyry olan perm iqlimi by hejvanlar uçun az əl-



Şəqil-122. Bronxiozavr.

1) Onlardan birisinin kafa tasьnьn yzynlygy bir mətrodan yzyndyr.

verişli idi. Axырыncь stegosefallar mezozoiq eranьn əvvəlinə kədər jaşamьşlardyr, və amfibilərin tarixi byradan kьrьlьr. Biz amfibilərin by əsqi formalarь ilə indiqi amfibi sьnьfь numynələri arasьndaqь rabitəni izləjə bilməriq.



Şəqil-123. Labirintodont dişinin jandan qerunuşu və qəsiqi.

Daş qəmur kit'ələrinin sahil bataklarь jalьnьz sonraqь qəmur çəqəcəq jerlər olmak e'tibarilə dejil, by bataklarda uzvi həjatьn təzə formalarь əmələ qəlınəsi nəktəji-nəzərindən maraklьdyr. Qeçən devrlərin jer flora və fayny kalьklarь bizə deməq olar qi, mə'lym dejildur. Belə mə'lym olyr qi, qembri-silyr və ola bilsin qi, hətta devon uzvi həjatь umymijjətlə jaşajьş beşiqi olan dənizlərdə toplanmьşdь. Dogrydyr, biz devonda kərə jaşajьşьna yjgynlaşmak istəjən dəniz organizmlərini qerduq. Laqin bynlar ancak təq-təq hallar idi. Jalьnьz karbonda kərəjə çьkmak qutləvi bir hadisə oldy. Byna, devrin umumi iqi məişətlilər şərtləri qeməq etdi, sy organizmlərini kərə organizminə çevirməq uçun bataklь çeqəqlər daha yjgyn bir muhit idi. Byna qerə də Valter karbony, dənizdən „bejuq çьkьş" devri adlandьrmьşdyr. By çьkьşьn səbəblərindən biri, həjat mubarəzəsi qəsqinliqi idi qi byny daş qəmur devi qestərir. Dənizin regressijasь onyn umymi səthini qiçiltdi. Həjat sьklьgь' çokaldь. By isə jьrtьcьlarьn inqişafьnь dogyrdy. Bynlardan jalьnьz qepəq balьgь şəqilli selaxijalarьn 300-ə kədər cinsini saja biləriq: onlar jьrtьcь, ac qez, cəld iinişlər; başlьca silahlarь olan iti, qəsqin və çejnəjici dişlərinin juqsəq dərəcədə mutəxəssisləşməsilə bizi təəccublandirir, və karbonyn sulh sevən faynynyn qemulmuş oldygy ag qirəç daşlarь içərisində hər jerdə həjat ygrynda qəsqin mubarəzəjə


Şəqil-124. Daş qəmur akyl dişləri.



şahid olan by kara dişlər (*şəqil*-124) qerulur. Əlum korkysy karşьsьnda organizm aləmi tələsiq səfərbərliqə alьnmьşdyr. Mərcanlar içərisindən mustəmləqə formalarь ustun qəlməqə başlajьr; bə'ziləri jьrtьcьlardan ezlərini tiqanlarь ilə muhafəzə edirlər; dəniz qirpiləri, sefalopodlar və gejri jymyşak bədəlilərdən hərəsi bacardьgь qibi silahlanьr və az bir zamanda fayn şəqlini tamamilə dəjişir. Birinci formalarda izsiz məhv olyrlar. Diqərləri trolobitlər qibiləri ezlərini şirin və az dyzly sylarda xьlas edirlər. Uçuncular isə dəniz uzunu byrakarak dəniz diblərində jaşajьrlar. Nihajət derduncular javaş javaş kərəjə qeçirlər. Axьrьncь jol bitqi aləminə də tətbik olyna bilər: bitqilər baglь səflər (sьralar) şəqlində syjyn altьndan kyryja hərəqət edirlər və kit'ələri halkalar ilə ajьrьrlar.

Belə dənizdən çьkma organizmləri sy təbiəti haqimijjətindən azad etməq prosesindən başka bir şej dejil idi; və ez nəticəsilə qələcəqdə umymijjətlə organizm aləminin mukəddəratь uçun çok muhum idi. Professor Zavjalov dediqi qibi, onlar dənizdən çьkarak dənizi ezləri ilə barabar aparmьşlardyr: mə'lymdyr qi, hejvan kanь muəjjən dyzlarьn məhsylydyr. Dəniz syjynda oldygy qibi, bynlarьn da içərisində ən muhum jerlərdən birisini klorly natriym dytyr. Lebin təcribələri dəniz dyzlarьnьn sy organizmləri fiziolozisi uçun bejuq əhəmijjəti oldygyny qestərir. Indi by dyzlar haman hejvanlarьn bədənlərinə daxil olmyşdyr və daxili manivelalar mislində organizmlərinin butun vəzifələrinə tə'sir edirlər.

**Daş qəmur sistemi.** Daş qəmur sistemi birinci dəfə Inqiltərədə tə'jin edilmiş. Ona qerə də bir çok zamanlar Inqiltərə karbonynyn kyrylyşy əsas hesab olynmyşdyr. By sistem byrada iqi şe'bəjə ajrьlьr: „dag qirəc daşь" dejilən aşagь kьsьm muxtəlif jymyşak bədənlilər və rizopodlar ilə doly dəniz qirəcindən ibarətdur; jykarь kьsьm isə muxtəlif katlar məcmyyndan (kym, qil və şist) ibarətdur qi, məşhyr Inqiltərə daş qemurləri də haman bynlarьn içərisində jatьr. Hər iqi şe'bə dəjirmən daşь hazьrlanan boz kym daşlarь katь ilə bir birindən ajrьlьr. Inqiltərədə də oldygy qibi, başka jerlərdə də dag qiraç daşlarь aşagьda, qəmurlu katlar isə, jykarьda oldygy zənn edərəq, qeologlar by cur bir-birinin ardьnca təbəkə duzuluşunu başka məmləqətlərdə də tə'jin etməqə çalьşmьşlardyr. Jalьnьz çok zaman qeçdiqdən sonra aşqar olmyşdyr qi, başka tip bataklar dəxi ola bilər. Bizim Şyralar Ittifakьnьn qəmurlu katlarь dag qiraç daşlarьndan jykarьda dejil, aşagьdadyr. By təfavut belə izah olynyr qi, təmiz dəniz çeqyntulərinin az syly və kontinental çeqyntulərlə əvəz edilməsi muxtəlif məmləqətlərdə cur-bə-cur nəticələr verə bilər. By da ez nevbəsilə kit'ələrin juqsəlib alçalmasьnьn və ja dənizin regressija və transgressijasьnьn

muxtəlif jerlərdə bir momentdə, hatta bir devrdə ola bilməməsindən asыlыdyr.

Kaledon kыrышыklarь devrindən və aşagь karbon dəvrinin bir kədər saqitliqindən sonra, bildiqimiz uzrə qersin jaşlь, şiddətli tektoniq hərəqətləri başlamыşdyr. By hərəqətlər orta karbonyn əvvəllərindən başlajarak, perm devrinin axыrьna qibi davam etmişdur. Devon qeosinklinallarь daha çok daralmыş və bynyn karşыlыgыnda kontinental qutləsinin səthi bəjumuşdur. Bynlarыn hər iqisinin mukəddəratыnda ajdыnca bir ziddijjət oldygyny qerməq olar: dag əmələ qətirən proseslər qeosinklinallarыn diblərini kыrышыklaşdыranda, qeosinklinallar muvəkkətən kyryjyrlar; by isə o saat kontinental qutləsi sahələrində dəniz transgressijasыna səbəb olyr. Inqiltərədə aşagь—daş qemur dəniz çequntuləri az syly və kontinental qemurlu serijalar ilə əvəz edilmişdur. Deməq by zamanlar Inqiltərə juqsəlməqə mə'ryz kalmыşdyr. Bizim Şyralar Ittifakыmыzda Inqiltərənin qemur təbəkəsi devrinə mukabil devrdə daş qemur dənizinin qeniş transgressijasь olmyşdyr.

Şimali Fransada, Belçikada və Almanjanыn şimali-şərkində karbonyn katlarь Inqiltərə kyrylyşyna bənzəjir. Byrada devlətli qemur jataklarь olan bir sыra daş qemur hevzələrinə rast qəliriq. Adəta, hər jerdə karbon katь dəniz çequntulərindən başlajarak, çok tədric ilə devon dəniz katlarыna qeçir. Beləcə də qestərilən məmləqətlərdə umymijjətlə jalыnыz alt və orta daş qemur çequntuləri vardyr. Ust çequntu katь isə jokdyr. Jalыnыz bə'zi jerlərdə qerməq olar. Avropanь, şimaldan cənyba qəsərəq bakarsak, bir cur kyrylyşly karbon katlarь olan rajonlar, Avropa yzyny fasiləli zollar ilə gərbdən şərkə yzandыgыnы qerməq olar. By sыrada zollardan daş qemur sisteminin cur-bə-cur mərtəbələrinin çыkdыgыnы qerməməq olmaz. Əqər Inqiltərədə, Belçikada və Vestfaljada ust karbon jok isə o zaman Bretanijadan Voqezə, Şvartsvalda və Saarbruqenə kədər yzanmыş zolda alt karbon jokdyr; bir az daha cənybda, mərqəzi Fransada, Bohemijada və Alplarda jalыnыz ust karbon tapыlыr. Byrasь maraklыdyr qi, kejd olynan zollar Ag dənizə paralel, jə'ni Ag dəniz qeosinklinalыna paralel olarak yzanыr, və dənizin o biri tərəfində Şimali Afrikada karbon çыkыşыnыn beləcə zollar ilə duzulduqunu qerməq olar. Qerunur qi, butun by hadisələr Ag dəniz qeosinklinallarь səbəbilə əlakədardyr. Butun karbon muddətində by qeosinklinallar sahəsində qeosinklinalыn sahil mintəkələrini muəjjən tədric ilə ihatə edən tektoniq hərəqətləri davam etmişdur. By hərəqətə tabe' olarak karbon dənizi qah byrada, qah orada muxtəlif təbəkələrdə çequntulər byrakarak bir jerdən başka jerə qeçmuşdur.



Haman by devrdə Şaıki Avropa tarixi ajrь curə cərəjan etmişdur. Byrada tarixin başlыca oky Ag dəniz en dajirəsi qeosinklinalь dejil, Yral meridional qeosinklinalь idi. Yral çeqəqində kədim paleozoid zamanыndan bəri fasiləsiz olarak həmişə dəniz var idi. By dəniz vaktdan vakta (və karbonda da) əzundən gərbə qeniş qerfəzlər ajыrыrdь. By qerfəzlər Baltiq kalkanыnыn juqsələn və ja alçalan hərəqətlərindən asыlь olarak qah enlənir və qah daralыrdь. Baltiq kalkanь tamamilə divə okşar bir piston qibi qah kalkыb qah duşərəq dəniz syjyny Yral qeosinklinalыndan Rysja platformasыna boşaldыr və sonra jenə təzədən qeosinklinala duşururdu. Baltiq kalkanь başdan - başa Şimali Avropa kit'əsinin (Atlantidanыn) jalыnыz kыrak şimali-şərk kabarыgь idisə də, laqin jakыn qeosinklinalыn Gərbi Avropadaqь qibi cənybynda olmajыb şərkində olmasь, qeolozi hadisələrinin qedişini tamamilə dəjişdirmişdi.

Şyralar Ittifakь əlqəsini basmыş dəniz, devon devrlərinin axыrыnda quclu syrətdə azaldь və deməq olar qi, hər tərəfdən baglь bir hoyz halыna qəldi. Jalыnыz kutub dənizi və orta Asja dənizlərilə balaca bir rabitəsi kaldь. By hoyzda kalыklarь m a l e v k o - m y r a j e v n i n adlь rys devonynyn axыrыncь katlarыnda tapыlan və məhv oldygy ajdыnca qerunən fayn jaşamыşdyr. Haman katlarda hətta daş qemur formalarыnыn aşkarыna da rast qəlməq olar: devon hiss olynmajarakdan karbon ilə əvəz edilmişdur. Daş qemur devrinin başlanmasilə, Sibir tərəfindən dənizin transgressijasь başlanmыşdyr. O zaman Rysja platformasыnыn təkribən butun şimali və şimali - gərbi Baltiq kalkanь ilə birliqdə olarak, juqsəlmə devrəsində bylyndygy uçun, uzərinə hərəqət edən dəniz gərbə dogry kabarmыş və Baltiq kalkanь ilə Cənybi Rysja kristal massivi arasыna sokylmyş olan Moskva - altь qerfəzi əmələ qətirmişdi. Cənybi kristal massivi sahəsində byndan başka Don hevzəsi də var idi. Devon dənizi xəritəsindən (*şəqil*-108) qerunur qi, by dəniz byndan əvvəlqi devrdə əmələ qəlmişdur: onyn dibində toplanmыş çequntulərdə devon uçun karakteriq olan zыrhlь balыklar tapmak olar. By çeqəqin əmələ qəlməsi pusqurmə maddələrinin təqulməsilə koşa olmyşdyr. Butun by hadisələr Don sыra daglarыnыn əmələ qəlməsinin başlangыcь idi, və bir də Don sыra daglarыnыn başlыca juqsəlməsi paleozoiq devri ən axыrlarыnda olmyşdyr [1].

Əzu ilə barabar rys platformasыnыn konşy sahələrini də juqsəldən Baltiq kalkanыnыn juqsəlməqdə davam etməsi səbəbilə alt daş qemur dənizi Moskva - altыndaqь çeqəqdə bir kədər kaldыk-

1) Byny da ilavə etməlidur qi, dag əmələ qəlməsi hərəqətləri butun mezozoj muddətində və hətta uçuncu devrin əvvəllərində byrada dəfələrlə jerdən başlanmыşdyr.

dan sonra jenə cənybi şərkə çəqildi, və dibi mejdana çькdь; byrada çykyrlar içərisində daş qəmur qizli majalanan bitqilər qəjərmiş olan, hesabsьz qөllər, bataklar əmələ qəlmişdi. Daş qəmur əmələ qəlməsi başlanьlan vəzijjət belə idi. Necə qi səjlədiq, by qəmurlar əsmər qəmur tipinə ajiddur. Bynlarьn içərisindən qennel qəmurləri və bogxedləri seçməq olar. Qəmurun lajlarьnьn nə əhəmijjətli kalьnlьgь və nə də qeniş jajьlmasь vardь və qil, kym, kym daşь lajlarь ilə lajlanmьşdyr; bizim qəmurlu katlar bynlar-




Şəqil-125. Şyralar Ittifakьnьn daş qəmur dənizi xəritəsi.

dyr. Bynlar Rijazan, Tyla, Kalyga və habelə də Tver və Novgorod grybernijalarьnda mə'lymdyr.

Şyralar Ittifakьnda qəmurlu suxyrlardan jykarь, bə'zi jerlərdə arasь qil və merqel ilə lajlanmьş, başlьca olarak ag və ja sarь, qirəc daşlarьndan və dolomitlərdən ibarət olan kalьn dəniz çəqun-



tuləri katь vardyr. By kat daş qəmur dənizi jeni transgressijasьnьn xatirəsi idi; by dənizin başlangьcьnь Baltiq kalkanьnьn tərs jə'ni alçalan hərəqəti kojmyşdy; əqər ust və orta daş qəmur çəquntulərinin çькdьgь jerlərin hamьsьnь xərita uzərində qөstərərsəq, 125-cь şəqil hasьl olar. Əlbəttə byny ynytmamalьdyr qi, by dəniz Şyralar Ittifakь əlqəsini birdən-birə basmamьş və birdən-birə də boşlamamьşdyr. Hətta bir neçə juz metro qirəç daşь katьnьn əmələ qəlməqi uçun neçə miljon illər lazьm oldygyny təsəvvur etməq belə çətindur. By bəjuq zaman içərisində dənizin hər bir nөktəsində fiziqi-cografi şərajit neçə dəfələrlə dəjişmişdur. By dəjişiqliq nəticəsində muxtəlif çəquntu materjallarь bir-birinin uzərində dal-ba-dal jatmьşdyr. By dəjişiqliqi və bynyn nəticəsi olan çəquntu katlarьnь dərin kazьlmьş hər bir daş çькarьlan jerdə qөrməq olar. Daş qəmur katlarьnь içərilərində tapьlan organizm kalьklarь uzrə bir sьra ajrь-ajrь təbəkələrə bөlməq mumqun olmyşdyr. Alt təbəkə byrada tez-tez rast qələn prodyktys (*Productus giganteus*; *şəqil*-126) adlь braşipod hejvanьnьn adь ilə prod'yktys təbəkəsi adьnь almьşdyr. Inqiltərə dag qirəc daşьnda da ejni rəhbərliq edici jerdən kalьklar oldygy



Şəqil-126. Productus giganteus.



Şəqil-127. Moskva təbəkəsinin braşipody: Spirifer mosquensis (sagdan) və Produstus semireticulatus (soldan).

uçun, by təbəkə ona yjgyndyr. Iqinci təbəkə serpyxov, uçuncu təbəkə—moskva adlanmьşdyr. Uçuncu təbəkəni braşipodyn

bir nev'i olan spirifer (*Spirifer mosquensis—şəqil*-127) karakterize edir. Byndan başka onda çokly fyzylin (*şəqil*-128) adlь rizopod



Şəqil-128. Fyzylinlər.

təsaduf olynyr. Bynlarьn qirəç kabьklarь daşlaşmьş çavdar dənini andьrьr. Dərduncu, gzel təbəkəsi, beşinci isə şvaqerin (*şəqil*-129) rizopod adьilə şьvaqerin təbəkəsi adlanmьşdyr.



Şəqil-129. Şvaqerin.

Muxtəlif jerlərin qəsiqlərini mukajasə edərəq bir jerdə bir cur təbəkə, diqər jerdə başka cur təbəkələr inqişaf etdiqini qerməq mumqundur. Deməq qi, dəniz jer uzu jerini dəjişmişdur. Ən alt təbəkələr yzyny Moskva cəvari hevzəsinin cənyb və şərk hissələrində mejdana çьkьr, və əqər Tyla və Tver gybernijalarьndan Moskvaja dogry hərəqət etsən o zaman əsqi təbəkələrin tədric ilə daha cavan təbəkələr dalьnda qizləndiqini qerəriq. Şvaqerin təbəkəsi jalьnьz Moskvadan şərkə tərəf inqişaf etmişdur. By ony qestərir qi, Moskva cəvarь hevzəsinin çok əjri-ujru hudydlarь muryri-zamanla şərkə qeçmuş və ejni zamanda daha duz meridional istikamətə jaklaşmьşdyr. Karbonyn axьrlarьnda dəniz təzədən şərkə dogry Volga və Yral sahəsinə sьkьşmьşdь.

Daş qəmur, qirəç daşlarь, organizm kalьkalrь ilə devlətlidurlər: fyzylinlərdən başka byrada bir çok braşipodlar, sefalapodlar qibi jymyşak bədənlilər, dəniz qirpiləri, dəniz zanbaklarь, mərcanlar (*şəqil*-130) və mərcana bənzər tabyljatalar vardyr. By



kalьklar katlar arasьnda bir cur bəlunməmişdur. Mərcan və ja dəniz zanbagь uzvlərilə doly katlar sьrasьnda paleontolozi nəktejinəzərindən „lal" katlar rast qəlir. Bə'zi qirəc daşlarь o kədər



Şəqil-130. Daş qəmur mərcanь (Petalaxis).

bulyrlaşmьşdyr qi, mərmərə çevrilmişdur. Diqərləri isə jymyşak təbəşir halьnda kalmьşdyr. Maraklьdyr qi, daş qəmur qutləsinin bə'zi katlarь çəquntulərin, çeqmə prosesinin arasь muvəkkəti olarak qəsildiqini qestərir: o zaman qirəç daşlarь arasьna devon kontinental təşəqqulatьnь andьran kьrmьzь rənqli qillər sokylyr. Belə suxyrlar karbonyn ust katlarьnda, xusysən çok olyr. Gzel təbəkəsi ezunun qilli, kymly suxyrlarь ilə ajdьnca dənizin dajazlaşmasьnь qestərir.

Don qerfəzində çəquntulərin çeqməsi bir kədər başka cur qedirdi; orada qirəç daşь əvəzinə, qəmur aralьk katlarь ilə barabar, kym daş və şistin kalьn katlarь jьgьlmьşdyr. Qerunur qi, qeosinklinallarda oldygy qibi, byrada da qerfəzin dibi yzyn muddət çeqməjə mə'ryz kalmьşdyr. Nihajət biz karbonyn quclu qutlələrini Yralda tapa bilariq. Yral silsiləsinin juqsəldiqi devrdə quclu svrət də dislokasjaja ogramьş by kat, indi Yralьn pusqurmə suxyrlarь ilə ajrьlmьş hər iqi jamacь bojynca yzanьr. Karbonda isə by kat butun devr ərzində arasь qəsilməqsizin jьgьlarak Yral qeosinklinalь dibində jerləşmişdi. Byna qerə də biz Yralda daş qəmur çəqun-

tulərinin aşagıda devon ilə karışan qəmurlu təbəkəsindən başlamış jykarısı fyzylinli ust təbəkəjə kədər olan butun serijasını qərurуq.

Daş qəmur sisteminin muxtəlif jerlərdə ajrı-ajrı çəquntuləri arasındaqı nisbət aşagıdaqı cədvəldə qəstərilmişdur:

| Kəsimlər | Inqiltərə, Belçika | Moskva cəvarı | Yral |
|---|---|---|---|
| Ust | — | Gzel təbəkəsi | Şvaqerin təbəkəsi. Ust və alt fyzylin qirəç daşı. |
| Orta | Qəmurlu katlar. Dəjirmən daşı kym daşı. | Moskva təbəkəsi | |
| Alt | Dıg qirəç daşı | Serpyxov təbəkəsi. Prodyktys təbəkəsi. Qəmurlu təbəkə. | Prodyktys təbəkəsi. Qəmurlu təbəkə: |

**Perm sistemi.** Karbonyn axırlarında dəniz Moskva cəvarı ətrafını boşlajarak butun paleozoiq devrində məhqəm dajanan Yral qeosinklinalı sahəsinə jıgışdı. Indi nevbə jer kabıgının by əjməsinə də çatdı. Byrada cənyb nissəsilə Orta Asjanın dag silsilələrilə rabitələnmiş Yral dag silsiləsi mejdana çıkdı. By juqsəlmə qeosinklinalı kyrytdy və ancak Yraldan gərbə tərəf indiqi Volga, Kama və Şimali Dvina sahəsində litosferdə meridional əjmə davam etməqdə idi. Dəniz ony dar, yzyn və kutub dənizindən paleozoiq Bojuq Ag dənizə—Tetisə kədər yzanan bogaz ilə işgal etmişdi. Laqin indiqi Oka hevzəsində əmələ qələn hundurluqlər ony yzak gərbə jajılmaga kojmadı. Paleozoj erasının perm devrini təşqil edən axırıncı etap qəstərilən vəzijjət daxilində qeçmişdur.

Silyr, devon və daş qəmur dənizlərinin dogrydan-dogryja varisi olan perm dənizinin həjatı bir can çəqişmə idi. Artık Yral qeosinklinalına səjqənməjərəq, jalınız əz kuvvəsinə tərq olynmyş bir halda hər tərəfdən ustunə hucym edən kyry kontinental jerlər haqimijjətində kalmışdı. Jalınız muvəkkəti olarak qenişləşir, və tamamilə kyryjyrdy. Onyn tamamilə itməsi paleozoiq devrin kyrtarmasını qəstərir.

Perm dəniz lajları məcmyy 5 təbəkəjə bəlunə bilər. By təbəkələr altdan jykarıja dogry aşagıdaqı kajda vardyr.

1—Artin təbəkəsi sahil karakterli konglomeratlardan və kym daşlarından ibarətdur. By təbəkənin faynları daş qəmur və perm formalarının karışık o'ması ilə seçilirlər. Onyn uçun by təbəkəjə çok qərrə „permokarbon“ adı verilir.

2—Kyngyr təbəkəsi—cibs və dyzdan aralık katları olan merqeldən ibarətdur. Fayny az və aşqar olarak sənmuşdur.

3—Yfa təbəkəsi kontinental çəquntuləri karakteriqdur (konglomeratlar, kymlar, qillər, cibs aralık katları, mis qulçələri).



4—Kazan təbəkəsi—Yralın gərb jamacı yzyny kym daşlı, Volga bojy və gərbə dogry qirəc daşlı dəniz çəquntuləridur.

5—Tatar təbəkəsi—muxtəlif rənqlərə: kırmızı, bənəfşəji, jaşıl („ala merqeli“) by bojanmış naziq zolly merqel və qilin murəqqəb serijasıdyr.

Byrada by və ja diqər suxyryn qəməqilə dəniz dibi dəjişmə-




Şəqil-131. Şyralar Ittifakında perm dənizinin xəritəsi.

ıri ajdın bir syrətdə qərulməqdədur: dərinləşməq qiraç daşlarının çəqməsilə olmyşdyr (2 *və* 4 *təbəkələr*). Dibin juqsəlməsi isə

uzərində aşьndьrmalarьn kontinental məhsyllrь çeqməqdə olan əlqənin kyryja çevrilməsinə səbəb olmyşdyr (3 *və* 5 *təвəkələr*).

Şyralar Ittifakьnьn perm çeqyntularinin jajьldьgь sahə, 131-ci şəqildə qestərilmişdur. Əlbəttə perm devri ərzində dəniz bir çok qurrələr şəqil və əlçulərini dəjişmişdur. 132-ci şəqildə perm hevzələri sahəsinin gərbdən şərkə dogry qəsilişi qestərilmişdur.

Perm dənizinin organizm aləmi daş qemur dənizindən çok fəkir idi. By da aşqardyr qi, perm qellərinin hər tərəfdən kapalь olmalarь səbəbilədur. Ən karakteriq formalar ammonoidlər sajьlьr. Bynlar da inqişaflarьnьn qyclu fasilələrilə seçilirlər.

Kyrymakda olan perm hevzələri əzlərindən sonra bizim uçun maraklь və təcribə uçun muhum xatirələr kojmyşlar qi, by da daş dyz (və cibs) jataklarьdyr. Dənizlərin qənarьnda indi Kaspi dənizində muşahədə edilməsi mumkun olan hadisələr əmələ qəlirdi: byrada xьrda syly qerfəzlər əmələ qəlir, və sonra by qerfəzlər kym daşlь dil ilə dənizdən ajrьlьrdьlar. Konşy kit'ələrin kyry iklimi sajəsində by hevzələrdə şiddətli təbəxxur əmələ qəldi; dəniz dyzy katь katьlaşdь, qerfəzlər dyz qellərinə çevrildi, və sonra byrada çeqmuş dyzlar kontinental çeqyntuləri altьnda qizləndilər. Məsələn, Iləstkdəqi məşhyr dyz bataklarь by cur əmələ qəlmişdur. Byna qerə də perm dənizi səthində bə'zi jerlərin məsələn, Solikamsk, Solvьçegodsk, Ysolje qibi jerlərin adlarьnda rysca dyz qəlməsinin bylynmasь təəcublu dejildur. Dyz jataklarь əmələ qəlməsi haman zamana maxsysdyr (Artemovsk şəhəri janьnda): Don çykyry perm devrində kyrymaga mə'ryz kalmьşdyr. Əlhasьl, daş qemur, karbon uçun nə kədər karakteriq isə, daş dyz da perm devri uçun o kədər karakteriqdur. By maddələrin hər iqisi by devrlərdə hequmranlьk edən cografi şərtlərin umymi məcmyyny ifadə edir.

Perm devrində vylkan pusqurmələri karbondan daha intensiv olmasьna və həttə atmosferə karbondan çok qemur tyrşysy çьkarmasьna bakmajarak, perm devrinin kyry iklimi, daş qemur əmələ qəlməsinə mane olmyşdyr. Bizə perm çeqyntulərindən muxtəlif jerlərdə




Şəqil-132. Şyralar Ittifakьnda perm katlarь səhəsi (Borisjak uzrə).

daşlaşmьş agaçlarьn jeqə meşələri mə'lymdyr. Bynlar daş qemurə çevrilməmiş, laqin silisləş nişlərdur. Axьrьncь proses uçun o zaman yjgyn şərajit olmamьşdyr. Bynynla belə, biz təbiətdə karbonyn jer kabьgьnda çeqməsinin başka usylyny biliriq. By da—neft əmələ qəlməsidur.



Daha çokdan neftin çьkmasilə dyz ocaklarьnьn şubhəsiz bir syrətdə əlakədar oldygyna dikkət edilmişdi. Belə qi, jerin bir çok nektələrində dyz jataklarь ilə asfaltьn sьkь bir konşy oldygy qerulur qi, asfalt mə'lym oldygy qibi neftin oksidləşmə məhsyldyr. By əlakə çok zamanlar elmdə jalьnьz Mendelejevin „neftiin terəməsi" teorijasь kəbyl edildiqindən, by bir çok zamanlar tamamilə ajdьnlaşmamьş kalmьşdyr. By teorija uzrə neft jer qurrəsinin dəmir nuvəsi (barisferi) ilə ona jykarьdan akan syjyn bir-birinə tə'sir etməsi məhsylydyr. Jerin nuvəsi karbonly dəmirdən ibarətdur. Sy, vylkan çatlaklarь ilə by nuvəjə suzulduqdə, orada təhlil olynarak karbonly dəmir ilə imtizac edir. Syjyn oksizeni dəmir ilə barabarlьkda dəmir oksidi əmələ qətirir. Hidorzen isə karbon ilə birliqdə, karbonly hidorzen əmələ qətirir. Karbonly hidrozen juqsəq temperatyra və bejuq təzjik altьnda polimerizasjaja mə'ryz kalarak, nefti əmələ qətirir. Axьr vaktlarda by teorija, xusysilə bynyn qeolozi hissəsində, jerin içinə kət'ijjən sy hopa bilməməsi məsələsi axьr zamanlarda bejuq e'tirazlara rast qəldi. Byna qerə də bir çok qeologar Engler tərəfindən 1888-ci ildə ifadə olynmyş neftin o r g a n i q teorijasьna muracəət etdilər. Englər jag və başka hejvan kalьklarьndan bejuq isti tə'siri ilə və bejuq təzjik altьnda cur-bə-cu karbonly hidrozenlər almьşdyr. Byna qerə də o belə rə'jə qəlmişdur qi, təbiətdə də hejvanlarьn kalьklarь beləcə təhlil olyna bilər. By teorija tədkik olynmyş və işlənilmiş, hal-hazьrda da mehqəmcə əsaslanmьşdyr. Beləliqlə daş qemur qejərtilərin təhlili oldygy qibi, nefti də haman dənizdəqi hejvanlarьn organizmlərinin təhlili hesab etməq olar. Neft by cur əmələ qəlmə nekteji-nəzərincə qemurə okşajьr. Ancak neft çok az jerlərdə bylynmakdadьr. Neftin əmələ qəlməsi uçun bir çok hejvanlarьn məhv olmasь və cəsədlərinin çeqyntulərlə ertulərəq istijə və təzjikə mə'ryz kalmalьdyrlar. By barədə kyryjan dəniz hevzələri çok əlverişli sahədədur. Həmişə Kara Bogaz qerfəzində qutləvi syrətdə dəniz hejvanlarьnьn məhv olmalarь misal olarak qestərilmişdur. Şubhəsizdur qi, Perm hevzələri sahəsində də by cur hadisələr qeniş syrətdə jajьlmьş idi. Perm sisteminin neft və asfalt ilə devlətli oldygyny bynynla ajdьnlaşdьrmak olar. Neft maje bir cisim olyb, bir katdan diqər kata qeçdiqindən, sistemin neft əmələ qələn təbəkəsini duzqun tə'jin etməq əlbətdə çətindur. Fersmanьn rə'jincə yfim təbəkəsi çeqən vaktlar neft əmələ qəlməsi uçun ən əlverişli moment hesab etməq olar.

Nihajət, kejd etməlidur qi, Perm çeqyntuləri mis (mə'dən daşlarь) qulçələrilə devlətlidur. Samojlov qestərmişdur qi by mis birləşmələrinin, perm dəniz organizmlərinin fiziolozi xusysijjətlərilə əlakəsi, onlarьn katlarьnda dəmirin mis ilə əvəz edilməsilədur. By da maraklьdyr: başka jerlərdə də (Almanjada) perm çeqyntulərinin həm mis və həm dyz ilə devlətli olmalarь maraklьdyr.

Indi Gərbi Avropanьn perm çəquntulərinə qeçəq. Bynlar, xususən tipiq olarak Almanjada inqişaf etmişdur. Byrada perm sisteminin 2 şə'bəsi qeologlara çokdan bəllidur—„əlu və kьrmьzь lezen" (alt) və „sexştejn" (ust). Bynlarьn arasьnda şiddətlə işlənən „misli şist" jatьr. Əlu kьrmьzь lezen kьrmьzь xьrda kym, kontinental mənşə'li qil ilə qejərti və jer uzu fəkərəlilərі kalьklarьndan ibarətdur. Sexştejn cibsli qil və dyz ilə ərtulmuş dəniz qirəç daşlarьdyr. By katlarda daş dyzyn məşhyr Stassfyrt jataklarь vardyr. Beləliqlə Avropa jalьnьz ust perm devrində dənizin transgressijasьna ogramьşdyr. By devrin birinci jarьsьnda o kyry və kontinental iklim haqimijjətində kalmьşdyr. By zamanlarьn səhra çəquntuləri Inqiltərədə „təzə kьrmьzь kym daşь" adьnь daşьjьr. Devon qibi perm devrləri də kontinentlərinin qeniş syrətdə jajьlmasь və kyry havasilə seçilir. Jalьnьz Cənybi Avropada Ag dəniz—Tetis qeniş syrətdə imtidad etmişdi. Bynyn Yral artin faynlarьna bənzər faynlarь tədric ilə karbonyn şvaqerin faynlarьnь əvəz etmişdur. Gərbi Avropa və Yral çəquntulərini dytyşdyrarak kazan təbəkəsinin Avropa sexştejninə tamamilə yjgyn oldygyny qerməq olar. Byna qerə də perm katlarьnьn nisbətini aşagьdaqь cədvəldə qestərməq olar.

| Şə'bələr | Yral | Gərbi Avropa | Don hevzəsi |
|---|---|---|---|
| Ust | Tatar təbəkəsi (Ala merqellər"). Kazan təbəkəsi | Dyzly kat Misli şist. Sexştejn | |
| Orta | Yfa təbəkəsi | Əlu kьrmьzь lezen | Kьrmьzь dyzly qil |
| Alt | Kyngyr təbəkəsi Artin təbəkəsi (permokarbon) | | Dolomitlər. |

Perm devrində Gondvanьn cənyb kit'ələrində çok maraklь hadisələr olmyşdyr. Byrada perm çəquntuləri şubhəsiz cisim donmalarьn izlərini daşьjьr. Morenin tiplərini Gondvanьn parçalarь olan məmləqətlərin hər jerində qerməq olar. Perm devrindən paleozoj erasьnьn bəjuq donma devri qibi bəhs etməq mumqundur. Əlbəttə Gondvanьn perm donmasь, Avropanьn jeni donmalarьndan daha pis əjrənilmişdur.

Perm donmalarьnьn butun organizm aləmi uçun olan muhum nəticələri tamamilə ajdьndyr [1]. Biz jykarьda daş qəmur qizli majalanan floralarьnьn jer uzundə tamamilə bir cur oldygyny kejd etmişdiq. Laqin karbonyn iqinci jarьsьnda və daha çok perm dəv-

1) Perm donmasьnьn səbəbləri tamamilə muəjjən edilməmişdur: Gondvanьn donmasь və uzərində şiddətli rutybət kondensasjasь əmələ qələn dag qutlələrinin juqsəlməsi, dag əmələ qətirən qeçmiş kuvvələ'in naticəsi ola bilər. Diqər qeologlar, qeolozi tarixi muddətində jerin ok və kutublər nin jerlərini dəjişməsini mumqun hesab edirlər. Cənybi kutub bir balaca indiqi Hind okjanysy sahəsinə qeçdiqdə, Gondvan donmasь tamamilə ajdьnlaşьr.



rində by bir curluq pozylyr. Gondvanda şimali jarьm qurrənin floryndan tamamilə seçilən və əzunə maxsys bir flora inqişaf edir. By flora ən çok intişar tapmьş ən karakteriq əjrilti otlarьndan birinin adьna qerə, glossoptəris dejilmişdur (*şəqil*-133). Qasьb



Şəqil-133. Glossopteris əjrilti oty.

və bir cinsli ap-açьk alçak temperatyranьn zərərli tə'sirlərini daşьjan flor lepidodendronlarьn və kalamitlərin devlətli formasjasьnь əvəz edir. Sonra, o hətta jerin şimali jarьm qurrəsi kit'ələrinə qeçir. Onyn kalьkları hətta Rysjada jykarь perm çəquntulərində belə tapьlmьşdyr. By Gondvan flory, paleozoj floryndan mezozoj floryna dogry arasь qəsilməqsizin inqişaf etmə prosesində bir dənumdur; sonralar şimali jarьm qurrənin bəjuq donmasь qibi, indi də perm byzlak devri organizm aləminin muvazənətini pozmyşdyr. Floryn tərqibi e'tibarilə alt perm, ust permdən çok fərklidur. Alt flor karbon florynyn duz bir davamьdyr. Permin iqinci jarьsьndan tiqan jopraklьlar mejdana çьkьr; bynlar mezozoiq devrində birinci jeri dytan bitqi formalarьnьn namizədidurlər. Əqər bitqilərin dəjişiqinə əsaslanacak olsak o zaman paleozoj və mezozoj arasьndaqь hudydy perm devrinin ortasьndan çəqməlidur. Tiqan japraklьlarьn formasjalarь əzlərilə barabar mezozojь açdьlar; by ta-



Şəqil-134. Parejazavr.

mamilə ajdьndyr; çunqu tiqan japraklь bitqilər kyry iklimə çok yjgyndyrlar.

Əqər fəkərəlilər aləmi karbon və perm hudydynda iklim dəjişiqliqindən mutəəsir olmamьş kalsa idilər təəcublu olardь. Rutybətli iklimin kyry iklimə dəjişilməsi, jeni reptilijalarьn. surunənlər grypynyn inqişafьna səbəb oldy. Dogrydyr onlarьn mejdana çьk-

masь uçun birinci nişanə karbonda qərunurdu; laqin by devrin rutybətli iklimi, amfibilərə daha .əlverişli olmyşdyr. Amfibilərin tərsinə olarak, reptilijalar hətta surfələr halьnda belə gəlsəmə ilə nəfəs almajьrlar və heç vakt jymyrtalarьnь da syja byrakmajьrlar.

Bynlar sy ilə hər bir əlakəni qəsmiş və hetta səhrada jaşaja bilən tamam bir kyry hejvanlarьdyr. Kyry perm devrində beləcə bir təşqilat lazьm idi.

Gondvanda və başka perm kit'ələrində jeni faynlar mejdana çькьr və kьsa bir zamanda formalarьn çok muxtəlif bir kompleksini hasьl edir. Əlbətdə perm reptilijalarь daha ibtidai gryplara ajiddur. Onlarьn təşqilatlarьnda, onlarь stegosefallara jakьnlaşdьran nişanələr vardyr və ejni zamanda onlarьn içərisində juqsəq syrətdə mutəxəssisləнmiş formalar da vardyr. Bə'zi reptilijalar məməlilərin nişanələrinə bənzər o kədər nişanələr daşьjьrlar qi, birinci dəfə onlarьn isqeletləri tapьldьgь zaman onlara məməlilər qibi bakmьşlardyr. Şubhə jokdyr bi, məməlilər өz ibtidalarьnь harada isə by formalarьn janьndan qəturərlər.



Şəqil-135. Inostransevija.

Pərm reptilijalarьndan ən maraklьsь bөjuq agьr tərpənən p a r e j a z a v r l a rdyr qi, (*şəqil*-134) onlarьn enli, jastь və yzynlygy 3 metroja çatan kafa tasь var idi. By ot jejən hejvanlarьn sьrasьnda daha junqul və cəld jьrtьcь grypda var idi. By grypa məsələn i n o s t r a n s e v i j a l a r (*şəqil*- 135) daxildur. Məməlilərə bənzəjən by cur reptilijalara t e r e m o r f a (canavar şəqilli) adь verilmişdur. Sinognatьn dişlərinin reptilijalara maxsys olan sadə



Şəqil-136. Sinognat.



qeqləri var idisə də fəkət məməlilər qibi kapan, qəpəq və azь dişlərinə ajrьlmьşdь (*şəqil*-136).

## MEZOZOJ ERASЬ.

**Mezozoj erasьnьn umymi karakteristikasь. Trias sistemi.** Rysjada mezozoj lajlarьnьn perm lajlarь uzərinə jatmasьnь muşahədə edən hər bir qimsənin by katlarьn faynlarь arasьndaqь qəsqin fərkləri qərməməsi mumqun dejildur. Birinci bakьşda bynlarьn arasьnda heç bir umymiliq olmadьgьnь kejd etməq olyr və ixtijarsьz bynlarьn arasьnьn birdən-birə qəsilməsi, əsqi aləmi məhv etmiş və yçyklarь uzərində jeni aləm kyrmyş bir katastrofyn nəticəsi olmasь hissi ojandьrьr. Perm, jaşlь renq bə-rənq şora suxyrlar uzərinə jatmьş kara qillərdəqi, hamьja mə'lym olan və belemnit qutləsinin byraja haradan qəldiqi anlaşьlmajьr.

Gərbi Avropada da qeolozi lajlarь qutləsində by cur ara qəsilmələri tez-tez muşahədə edilə bilər. Avropanьn qeolozi-tarixi fasiləli temp ilə hərəqət etmişdur: vakьlə şimalda olan Atlantida kitəsinin sahillərini işgal edərəq və cənybdan Tetis okjanysy ilə ihatə edilmiş Avropa qah kontinental çөquntulərinin katlarь ilə өrtulurdu, qah by çөquntulər uzərinə өz çөquntulərini byrakan dəniz səvijjəsi altьna qizlənirdi. Dəniz ilə kyry arasьndaqь by fasiləsiz mubarəzə nəticəsi olarak, Avropada jerin kabьgь muxtəlif tərqibli və mənşə'li suxyrlardan təşqil edilmiş oldygy mejdana çькmьşdь. Həmin by vəzijjət qeolozijə jaxşь xidmətdə bylynmyşdyr; by qeologlara butun kabьgь bir sьra mərtəbələrə bөlməq və tarixin umymijjət uzrə əsasьnь təşqil edən qeolozi xronolozisini jaratmaga imqan vermişdur; ony da kejd etməlidur qi, vaktilə həmin by xronolozi jerin tarixinin saqit akьmьnьn dəfələr ilə arasьnь qəsən cihan katastroflarь hakkьnda qeologlarda səhv bir fiqrin ojanmasьna səbəb olmyşdyr. Hər nə cur də olsa qeolozi bir elm halьnda bilxassə Avropada jaranmьş və byrada kyrylan sxemalar sonra başka məmləqətlərədə jajьlmьşdyr.

Qembridən biz jaşadьgьmьz zamana kədər Avropada arasь qəsilməqsizin dərin dəniz olsa idi, byrada çok bөjuq və bir cinsli çөquntu katь toplanardь və byrada cihan zamanьnьn ritmini qөrməq mumqun olmazdь.

Laqin sistemlərin və devrlərin nevbə ilə dəjişmələrinin arasь qəsilmələrinə istinad edərəq, sonra qeologlar, belə ara qəsilmələ olmajan və həjat birliqi heç bir zaman pozylmajan jerlərə, dikkət etməli oldylar. Ancak sistemlər arasьnda qeçid katlarь taparak, onlar qeolozi tarixinin ajrь-ajrь hadisələrində dogrydan da vahid bir tə'sir oldygyny kejd edə bildilər.

Avropada paleozojdan sonra mezozojyn birdən-birə başlandьgьna bakmajarak, başka jerlərdə by, tədriclə əmələ qəlir. By jer-

ləri. dəjişilməqsizin paleozoj və mezozoj muddətindən davam edən, dərin qeosinklinaldan ibarət olan Tetis okjanysy sahələrində aktarmalьdyr. Himalaj daglarьnda içərisində perm faynyndan başlamьş mezozoj faynyna qibi butun formalarьn sьrasь bylynan lajlara təsaduf etməq olar.

Mezozoj erasь: triasь, ƶyra və təbəşir devrləri olmak uzrə 3 devrə ajrьlьr; trias Tetisinin dərinliqlərindəqi perm formalarь, mezozoj formalarьna çevrilmişdur, və sonralar Cənybi Avropanьn Trias dənizi Atlantida uzərinə hucym etdiqdə, өzu ilə barabar sahil qөllərində Avropa uçun jeni olan, kьrmьzь kym daşь katlarьna sokylmyş өz faynyny qətirdi.

Avropada butun trias devri Tetis okjanysy ilə Atlantida kit'əsi arasьndaqь mubarəzə ilə qeçmişdur. Almanjada, xusysən, inqişaf etmiş trias çөquntusu uç kьsma ajrьlьr. Alt kьsmь təşqil edən „alaca kym daşь" adlanan kьsm, konglomeratdan, kym daşьndan və muxtəlif rənqli şistlərdən ibarətdur; by kьsьm kontinental çөquntusudur. Bynlar kyry iklimdə qersin jaşlь dag silsilələrinin dagьlmasьndan əmələ qəlmişdur. Orta kьsьm „kabьklь qirəc daşь" adlanьr. By dəniz qirəc daşьndan və (seratitli) merqeldən ibarətdur: ajdьndyr qi, Trias okjanysy kit'ələr uzərinə transgressijaja başladь, və alçak məhəlləri basdь. Laqin by zaman Almanjada əmələ qəlmiş dəniz qiçiq və dөrt tərəfi baglь bir hoyz əlamətlərini daşьjьr; by hoyzda cinscə az, mikdarca çok fayn inqişaf etmişdur. Ust kьsьm „qejper" adlanьr; byny jenə jenidən kontinental və sahil qөlu çөquntuləri' cipsli rənq-bə-rənq qillər və kym daşlarь, dyz və reptilija (surunənlər) kalьklь suxyrlar təşqil edir. Dəniz jenidən jenə qeri çəqilmişdur. Triasь devrində Almanjanьn tarixi belə olmyşdyr. Başka jerlərdə kərə ilə apardьgь mubarəzədə, dəniz hətta muvəkkəti də olsa muvəffəkijjət kazanmamьşdyr. Məsələn, Inqiltərədə butun devr yzyny arasь qəsilməqsizin ancak „jeni kьrmьzь kym daşь" toplanmaga davam edirdi, və ancak triasь devrinin ən axьrьnda cənybdan Trias dənizi bynlarьn uzərinə hucym etmiş və өz katlarь ilə (retiq təbəkə) triasьn nihajətini kejd etmişdur.

Tetis sahəsində cənybi Avropada başka hadisələr tөrəjirdi. Byrada həkiki mərcan dənizi var idi; hər jerdə rəsiflər juqsəlirdi, Qirəç Alplarьn və dolomit Tirolyn qөzəl mənzərəsinə səbəb həmin by rəsiflərin qirəçləri olmyşdyr.

Avropanьn şərk hissəsində Triasьn mənzərəsi qərb hissədəqi mənzərəni andьrьr: Tetis okjanysynyn qөrfəzləri ajrь-ajrь nөktələrdə və muvəkkəti olarak kontinental qutləsinə sokylyr (Krьmьn, Kafkasjanьn katlarь by kajda ilə başa qəlmişdur); by qөrfəzlərin birisi bizim Kaspi bojy sahələrinə sokylyr və Baskynçak şor qөlunun janьndaqь Bogdo dagьnda alt triasь kalьklarьnь indi də qөrməq olar. Byradan şimala dogry, Volga və Kama hevzəsində perm devrindəqi qibi rənq-bə rənq merqellər çөqməqə davam edirdi; by çөquntulər qyja qi, by jerin və jeni „kьrmьzь kym daşь" devrli Inqiltərənin cografi şərtlərinin bir-birinə okşadьgьnь kejd edirdi (*şəqil*-131 *bak*).

Bөjuq Şimali Avropa kit'əsi həm şərk kyrtaracagьnda və həm gərb kyrtaracagьnda sarsьlmaz bir syrətdə dyryrdy. Ancak mərqəzi hissələrdə trias dənizi ony basmaga addьmlar atьrdь (kabьklь qirəç daşь dənizi).

Trias devri Avropada deməq olar qi, butun paleozoj muddətində davam edən umymi kajdalarьn sonyncy mərhələsi hesab olyna bilər. Silyryn iqinci jarьsьndan başlamьş, triasьn axьrьna qibi karşьmьzdan qeoloƶi hadisələrinin bөjuq bir devri qeçir. Ust silyrda ojanan tektoniq kuvvələri devon devrində kaledon qeosinklinalьnь bagladьkda, Şimali Atlantida kit'əsi təşqil olyndy; onyn səthi qersin kьrьşmalarь devrində qenişləndi, karbon və perm devrlərində juqsələn bөjuq silsilələr, onyn vəzijjətini daha da möhqəmləşdirdi; çok bөjuq oldygyndan, dəniz tə'sirinə tabe olmajarak, devon və perm devrlərində səhra karakterini saklajьrdь: „kədim" və „jeni" kьrmьzь kym daşь katlarьnda daş qөmur katlarь ancak nazik katlar halьnda qөrsənirdi qi, by, daş qөmur devrində kyry və sy şərtlərinin çok az muddət davam etməsini qөstərir. By hal həmçinin triasda da davam edirdi. Ancak „kabьklь qirəc daşь" dənizi, serxştejn dənizi qibi by kontinental qutləsinə daxil olmak istədi. Laqin vəzijjət kyrynyn xejrinə olmajarak javaş-javaş dəjişirdi. Qersin daglarь dagьlьrdь və bynynla barabar da kit'ələri dənizin hucymyndan mudafəə edən barjerlər, səddlər jok olyrdy. Okjanys, denydasja tərəfindən həmvarlanmьş kyry uzərinə qeniş cəbhə ilə hucyma qeçməqə başlaja bilərdi. Bynynla bir devr kyrtardь və diqəri başlandь.

Ƶyra devri qirdi. Dəniz yzyn dillər şəqlində kit'əjə sokylyb ony takьm adalara bөlurdu. Jer kabьgьnьn əhəmijjətsiz təprənmələri hevzələrin şəqlini daima dəjişdirirdi; kyry və denizin belə sabit olmamagь, butun ƶyra və təbəşir devrləri yzyny hiss edilirdi. Ancak təbəşir devrinin iqinci jarьsьnda dəniz kət'i syrətdə ustun

qəlmişdur; və təbəşir transgressijasь sanqь ust silyr transgressijasьnьn təqrarьdyr.

Kьrmьzь kym daşlarь ustundə dəniz çəquntulərinin jeqə katlar qutləsi təşqil etməqinə bakmajarak, umymijjət uzrə by çəquntulər dənizin dərin olmamasьnь qəstərir. Dərin sylar çəquntulərinə ancak qeosinklinallarda rast qəlməq ola bilər: laqin qeosinklinallar da kabakqь qibi dejildur. Paleozojda çok enli olanlar, indi ensiz lenta şəqlindədur və dərin xəndəqlər şəqlində bəjumuş kontinental qutlələrini bir-birindən ajrьr (*şəqil*-137). Bynlar butun mezozojda by halda olyr və ancak uçuncu devrdə tamam itir.



Şəqil-137. Mezozoj erasьnьn qeosinklinallarь və kontinental qutlələri.


Şəqil-138. Ixtiozavr.

Jer uzərində ajrь-ajrь xьrda kit'ələrin və dəniz kollarьnьn bir-birinə sьkь bir syrətdə ərulməsindən ibarət jymyşak, nəmişli və muntəzəm bir iklim başladь. By iklim reptilijalar uçun çok əlverişli idi və byna qərə də mezozoj erasьnda bynlar ən artьk inqişaf etmişlərdi. Syda, kyryda və havada bynlar kajnaşьrdь. Dənizdə yzynlygy 20 metroja çatan delfin şəqilli **i x t i o z a v r l a r** (*balьk qərtənqələr*—*şəqil*-138) və yzyn bogazь uzəиində çok qiçiq başь olan **p l e z i o z a v r l a r** uzurdu. Kyryja çok bəjuq **d i n o z a v r l a r** sahьb olmyşdy və ən qəsqin xəjalat belə by nagьl drakonlarьnьn (divlərinin) nə kədər cur-bə-cur olmasьnь təsəvvur bilə edəməz. Bynlarьn ərasьnda agьr tərpənən, ot jejən **b r o n t o z a v r** (*şəqil*-139) və **m e g a l o z a v r l a r** qibi (*şəqil*-143) daha junqul və biçimli jьrtьcьlar da var idi. Yzyny 35 *m.* çatan çok bəjuq diplodoklarьn və ja atlantozavrlarьn da belə tipləri var idi. Belində sumuq levhələrdən daragь olan **s t e g o z a v r ь n** (*şəqil*-140) bəjuq qəjdəsi və çok qiçiq kafa tasь var idi; bynyn əvəzində onyn irtməqinin (haçar sumuqunun) janьnda haram iliq kanalь qenişlənirdi;




Şəqil-139. Brontozavr.


Şəqil-140. Stegozavr.

